**Mündərəcat**

# "Rəcəb ayının fəzilətləri"

Bu yazı görkəmli alim, böyük mühəddis, məşhur fəqih və sinəsi Əhli-beyt (ə) maarifinin xəzinəsi olan cənab Şeyx Səduqun (305 – 381 hq) "Fəzailu-əşhuris-səlasə"[1] – (üç mübarək ayın fəzilətləri) – kitabından çıxarışdır. Belə ki, Şeyx Səduq bu kitabda üç mübarək ayın (Rəcəb, Şəban və Rəməzan) fəzilət və əməlləri barəsində 158 hədis hədis rəvayət etmişdir ki, biz "Rəcəb" ayının daxil olması münasibətilə, bu ayın barəsində olan 18 hədisi tərcümə edib, sizə təqdim edirik.

Amma əvvəlcə Şeyx Səduq haqqında qısa məlumat verməyi məqsədə uyğun bilirik. Çünki bu böyük alimin Şiə ədəbiyyatının bu günə gəlib çıxmasında misilsiz rolu olmuşdur. Buna görə də az da olsa bu alimin həyatı haqqında hamımız bilməliyik.

## Şeyx Səduq kimdir?

O, Məhəmməd bin Əli bin Hüseyn bin Musa bin Babuvəyh Qumidir. Hicri tarixi ilə 305 ya 306-cı ildə Qum şəhərində anadan olmuşdur. Atası Qumlu və anası Gilanlıdır (Deyləm). O və qardaşı Hüseyn bin Əli İmam Zamanın (ə) duası ilə dünyaya gəlmişdir. [2]

## Şeyx Səduqun atası

Şeyx Səduqun atası Əli bin Hüseyn hicri tarixinin üçüncü əsrində yaşamış, şiə aləminin böyük alimi və Qum mühəddislərinin (hədis

*1 - "Fəzailul-əşhurus-səlasə", Şeyx Səduq, Əbu Cəfər Məhəmməd bin Əli bin Hüseyn bin Musa bin Babuvəyh Qumi (vəfat:381 hq), Nəşr: Məktəbətul-adab, Nəcəf, 1379 hq, 1-ci çap;*

*2 – "Fərəcul məhmum fi tarixi üləmain-nücum", Seyid Tavus (664 hq), s.258; "Əl-Xəraic vəl Cəraih", Qütbuddin Ravəndi (573 hq), 2/706 və 790; "Əl-Fəvaid ət-tusiyyə", Hürr Amuli (1104 hq), s.7-13; "Tənqihul-məqal", Şeyx Abdullah Maməqani", 3/154; "Əl-Kunyə vəl əlqab", s.416. – "Töhfətul-əhbab", s.335. - "Fəvaidur-rəzəviyyə", Şeyx Abbas Qumi, s.701; "Ricalu Bəhrul-ulum", Əllamə Təbatəbai, 2/292.*

rəvayətçiləri) rəhbəri olmuşdur. Bəzi yazılara görə o, İmam Həsən Əsgəri (ə) zamanında cavan olmuş və İmam Əsgərinin (ə) ona yazdığı məktub mövcuddur. O, (Əli bin Hüseyn) 329-cu hicri ilində vəfat etmişdir.[3] Atasının vəfatından sonra Şeyx Səduq Rey şəhərinə köçmüş və orada yaşamış, yaratmış və 381-ci hicri ilində orada vəfat etmişdir. Məzarı Rey şəhərində ziyarətgahdır.

Tarix və rical kitablarında yazılanlara əsasən, Şeyx Səduq 300-ə yaxın hədis kitabı yazmışdır ki, tarix boyu müxtəlif səbəblər ucbatından məhv olmuş və günümüzdə bu kitablardan yalnız iyimisi mövcuddur ki, onlardan "Mən la yəhzuruhul fəqih", "əl-Xisal", "Səvabul əmal və iqabul əmal", "əl-Muqnə", "Kəmaluddin", "İləluş-şərayi", "Uyunu əxbarur-Riza (ə) ", Məaniul əxbar"a işarə etmək olar.

## Ata və oğlun məqamı

Şeyx Səduq və atasının üstünlükləri barəsində alimlər çox danışıb, yazmışlar ki, biz bu barədə aşağıdakı dastana kifayət edirik:

"Əli bin Hüseyn hələ çox cavan ikən İmam Həsən Əsgəridən (ə) belə bir məktub aldı:

**«... امّا بعد اوصيك يا شيخى و معتمدى و فقيهى ابا الحسن على بن الحسين بن بابويه القمّى وفّقك اللّه لمرضاته و جعل من ولدك اولادا صالحين برحمته،... و عليك بالصبر و انتظار الفرج... فاصبر يا شيخى و معتمدى أبا الحسن و أمر جميع شيعتى بالصبر فانّ الارض للّه يورثها من يشاء و العاقبة للمتقين و السلام عليك و على جميع شيعتنا و رحمة اللّه و بركاته...»**

"Ey mənim şeyxim, etmiad etdiyim və fəqihim...! Allah-Taala səni Özünün razı olduğu işlərə müvəffəq etsin və sənin nəslində saleh övladlar

*3 - "Fehresu əsmai musənnifuş-şiə", Nəcaşi (450 hq), 261/684; "Əl-Fehrest", Şeyx Tusi, 93/382; "Məcalisul mominin", Qazi Nurullah Şuştəri (1019 hq), 1/453; "Tarixu Qum", MuhəmmədHüseyn Nasiruş-şəriə, s.248; "Təsisuş-şiə", Seyid Həsən Sədr, s.331.*

qərar versin... Səni səbrə və Fərəcin (12-ci imamın) intizarına dəvət edirəm!... Elə isə səbr et və bütün şiələrimi də səbr etməyə çağır!..."[4]

"... Şeyx Səduqun atası (Əli bin Hüseyn) öz əmisi qızı ilə ailə həyatı qurmuşdu. Amma qocalmasına, yaşının altımışı keçməsinə və bu məktubdan illər ötməsinə baxmayaraq övladı olmurdu. Bir gün onun yolu Bağdad şəhərinə düşdü. Bu zaman İmam Zamanın (ə) 3-cü naibi Şeyx Əbul Qasim Hüseyn bin Ruh Bağdadda idi. Əli bin Hüseyn onunla görüşdükdən sonra İmam Zamana (ə) məktub yazır və məktubda İmamdan (ə.c) istəyir ki, İmam onun üçün övlad duası etsin. Və məktubu 3-cü naibdən İmamın (ə.c) hüzuruna göndərir.

Bir müddətdən sonra İmamdan (ə.c) belə bir cavab məktubu gəlir:

***"... Allah-Taala tezliklə sənə Deyləmli qızından iki xeyirli, əməli-saleh və fəqih (alim) oğlan bəxş edəcəkdir...".***

Bu duadan sonra Əli bin Hüseyn iki və onlardan sonra da bir oğlana sahib oldu (Məhəmməd – Həsən – Hüseyn) ki, hər üçü alim və zahid idilər. Belə ki, Məhəmməd (Səduq) hədis əzbərləməkdə öz zamanında misilsiz idi. Və həmişə iftixarla deyirdi ki, mən İmam Zamanın (ə) duası ilə dünyaya gəlmişəm!".[5]

---

*4 - "Xatəmətul-mustədrək", Muhəddis Nuri, 3/277; "Ğənaimul-əyyam", Mirzayi Nuri,1/30; "Məcalisul mominin", Şuştəri, 1/453; "Tətimmətul muntəha", Şeyx Abbas Qumi, s.402; "Təsisuş-şiə", Seyid Həsən Sədr, s.331;*

*5 - "Əl-ğeybə", Şeyx Tusi, s.308-320; "Kəmaluddin və təmamun-nemət", Şeyx Səduq, 2/502/bab:45; "Əl-xəraic vəl cəraih", Ravəndi, 2/706; "Əlamul-vura", Təbərsi, s.451; "Məcalisul mominin", Qazi Nurullah Şuştəri (1019 hq), 1/453; "Təsisuş-şiə", Seyid Həsən Sədr, s.331; "Ğənaimul-əyyam", Mirzayi Qumi (1232 hq), 1/30; "Tətimmətul muntəha fi tarixil xuləfa", Şeyx Abbas Qumi, s.402; "Nameye daneşvəran", Nasiri, 1/2.*

# “Fəzailu əşhuris-səlasə”

# - Üç ayın fəzilətləri

# “Kitabu fəzaili şəhri rəcəb”

# - Rəcəb ayının fəzilətləri kitabı

***Bismillahir-rəhmanirrəhim. Əl-həmdu lillahi rəbbil aləmin. Və səlləllahu əla Muhəmmədin və alihi əcməin.***

Bağışlayan və rəhm edən Tanrının adı ilə ki, həmd və səna ona məxsusdur. Və onun salam və salavatı olsun Məhəmmədə (s) və onun pak övladlarına (ə).

## 1-ci hədis:

## Rəcəb ayında oruc tutmağın savabı

**«عَنْ أَبِي الْحَسَنِ عَلِيِّ بْنِ مُوسَى الرِّضَا (ع) قَالَ مَنْ صَامَ أَوَّلَ يَوْمٍ مِنْ رَجَبٍ رَغْبَةً فِي ثَوَابِ اللَّهِ عَزَّ وَ جَلَّ وَجَبَتْ لَهُ الْجَنَّةُ وَ مَنْ صَامَ يَوْماً فِي وَسَطِهِ شُفِّعَ فِي مِثْلِ رَبِيعَةَ وَ مُضَرَ وَ مَنْ صَامَ فِي آخِرِهِ جَعَلَهُ اللَّهُ مِنْ مُلُوكِ الْجَنَّةِ وَ شَفَّعَهُ فِي أَبِيهِ وَ أُمِّهِ وَ ابْنِهِ وَ ابْنَتِهِ وَ أَخِيهِ وَ عَمِّهِ وَ عَمَّتِهِ وَ خَالِهِ وَ خَالَتِهِ وَ مَعَارِفِهِ وَ جِيرَانِهِ وَ إِنْ كَانَ فِيهِمْ مُسْتَوْجِبٌ لِلنَّارِ»؛**

“İmam Rza (ə) buyurur: Kim Rəcəb ayının birinci günü Allahın savabını əldə etmək üçün oruc tutsa, Allah-taala cənnəti ona vacib edər. Kim bu ayın ortasında oruc tutsa, Rəbiə və Müzər tayfaları qədər insanları (yəni çox sayda insanı) şəfaət edər. Kim bu ayın axırında oruc tutsa, Allah-taala onu cənnət şahlarından qərar verəcək və onun şəfaətini ata-anası, oğul-qızı, bacı-qardaşı, bibi, xala, əmi, dayı, qonşuları və tanıdıqları barəsində, əgər onlar oda layiq olsalar da belə, qəbul edəcəkdir”.

# 2-ci hədis:

*Rəcəb ayının orucu odla insan arasında fasilə yaradır*

**«عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ سَمِعْتُ النَّبِيَّ (ص) يَقُولُ مَنْ صَامَ يَوْماً مِنْ رَجَبٍ إِيمَاناً وَ احْتِسَاباً جَعَلَ اللَّهُ تَبَارَكَ وَ تَعَالَى بَيْنَهُ وَ بَيْنَ النَّارِ سَبْعِينَ خَنْدَقاً عَرْضُ كُلِّ خَنْدَقٍ مَا بَيْنَ السَّمَاءِ إِلَى الْأَرْضِ»؛**

"Ənəs bin Malik deyir: Eşitdim ki, Peyğəmbər (s) buyurur: Kim Rəcəb ayında iman və qürbət qəsdi ilə (Allaha yaxın olmaq) bir gün oruc tutsa, Allah-Taala Qiyamət günü onunla Cəhənnəm odu arasında yerlə göy arası qədər fasilə yaradacaqdır".

# 3-cü hədis:

*Rəcəb orucunun savabının miqdarını yalnız Allah bilir!*

**«عَنْ عَلِيِّ بْنِ سَالِمٍ عَنْ أَبِيهِ قَالَ دَخَلْتُ عَلَى الصَّادِقِ جَعْفَرِ بْنِ مُحَمَّدٍ (ع) فِي رَجَبٍ وَ قَدْ بَقِيَتْ أَيَّامٌ فَلَمَّا نَظَرَ إِلَيَّ قَالَ لِي يَا سَالِمُ هَلْ صُمْتَ فِي هَذَا الشَّهْرِ شَيْئاً قُلْتُ لَا وَ اللَّهِ يَا ابْنَ رَسُولِ اللَّهِ (ص) قَالَ لِي لَقَدْ فَاتَكَ مِنَ الثَّوَابِ مَا لَا يَعْلَمُ مَبْلَغَهُ إِلَّا اللَّهُ عَزَّ وَ جَلَّ إِنَّ هَذَا الشَّهْرَ قَدْ فَضَّلَهُ اللَّهُ وَ عَظَّمَ حُرْمَتَهُ وَ أَوْجَبَ لِلصَّائِمِينَ فِيهِ كَرَامَتَهُ قَالَ قُلْتُ لَهُ يَا ابْنَ رَسُولِ اللَّهِ فَإِنْ صُمْتُ مِمَّا بَقِيَ شَيْئاً هَلْ أَنَالُ فَوْزاً بِبَعْضِ ثَوَابِ الصَّائِمِينَ فِيهِ فَقَالَ يَا سَالِمُ مَنْ صَامَ يَوْماً مِنْ آخِرِ هَذَا الشَّهْرِ كَانَ ذَلِكَ أَمَاناً لَهُ مِنْ شِدَّةِ سَكَرَاتِ الْمَوْتِ وَ أَمَاناً لَهُ مِنْ هَوْلِ الْمُطَّلَعِ وَ عَذَابِ الْقَبْرِ وَ مَنْ صَامَ يَوْمَيْنِ مِنْ آخِرِ هَذَا الشَّهْرِ كَانَ لَهُ بِذَلِكَ جَوَازٌ عَلَى الصِّرَاطِ وَ مَنْ صَامَ ثَلَاثَةَ أَيَّامٍ مِنْ آخِرِ هَذَا الشَّهْرِ أَمِنَ يَوْمَ الْفَزَعِ الْأَكْبَرِ مِنْ أَهْوَالِهِ وَ شَدَائِدِهِ وَ أُعْطِيَ بَرَاءَةً مِنَ النَّارِ»؛**

"Əli bin Salim deyir: Rəcəb ayının axırlarında mən İmam Sadiqin (ə) hüzuruna yetişdim. İmam (ə) məni gördükdə buyurdu: Ey Salim, bu ay oruc tutdun!

Dedim: Xeyr, ey Allahın Rəsulunun (s) oğlu.

İmam (ə) buyurdu: Elə bir savabı itirmisən ki, miqdarını Allahdan başqa heç kəs bilmir. Həqiqətən Allah-Taala bu ayı fəzilətli və hörmətini böyük etmişdir. Öz kəramətini bu ayda oruc tutanlara vacib etmişdir.

Dedim: Ey Allahın Rəsulunun oğlu, əgər qalan günləri oruc tutsam, bu ayda oruc tutanların savabına çataram?

İmam (ə) buyurdu: Ey Salim! Kim bu ayın axırından bir gün oruc tutsa, bu oruc onu ölümün çətinlikləri və qəbrin əzabından amanda saxlayacaqdır. Kim bu ayın axırından iki gün oruc tutsa, bu onun üçün Sirat körpüsündən keçid vərəqəsi olacaqdır. Kim bu ayın axırından üç gün oruc tutsa, Qiyamət gününün çətinliklərindən amanda qalacaq və bu oruc onu Cəhənnəm odundan qoruyacadır".

## 4-cü hədis:

## Rəcəb ayında oruc tutan, yenidən dünyaya gəlir!

«عَنْ أَبِي جَعْفَرٍ مُحَمَّدِ بْنِ عَلِيٍّ (ع) قَالَ مَنْ صَامَ مِنْ رَجَبٍ يَوْماً وَاحِداً مِنْ أَوَّلِهِ أَوْ وَسَطِهِ أَوْ آخِرِهِ أَوْجَبَ اللَّهُ لَهُ الْجَنَّةَ وَ جَعَلَهُ مَعَنَا فِي دَرَجَاتِنَا [دَرَجَتِنَا] يَوْمَ الْقِيَامَةِ وَ مَنْ صَامَ يَوْمَيْنِ مِنْ رَجَبٍ قِيلَ لَهُ اسْتَأْنِفْ فَقَدْ غُفِرَ لَكَ مَا مَضَى وَ مَنْ صَامَ ثَلَاثَةَ أَيَّامٍ مِنْ رَجَبٍ قِيلَ لَهُ غُفِرَ لَكَ مَا مَضَى وَ مَا بَقِيَ فَاشْفَعْ لِمَنْ شِئْتَ مِنْ مُذْنِبِي إِخْوَانِكَ وَ أَهْلِ مَعْرِفَتِكَ [مَغْفِرَتِكَ] وَ مَنْ صَامَ سَبْعَةَ أَيَّامٍ مِنْ رَجَبٍ أُغْلِقَتْ عَنْهُ أَبْوَابُ النِّيرَانِ السَّبْعَةُ وَ مَنْ صَامَ ثَمَانِيَةَ أَيَّامٍ مِنْ رَجَبٍ فُتِحَتْ لَهُ أَبْوَابُ الْجِنَانِ الثَّمَانِيَةُ فَيَدْخُلُهَا مِنْ أَيِّهَا شَاءَ»؛

İmam Baqir (ə) buyurub: "Kim Rəcəb ayının əvvəli ya ortası və ya axırından bir gün oruc tutsa, Allah-Taala Cənnəti ona vacib edəcək və onu Qiyamət günü Bizimlə bir yerdə məşhur edəcəkdir.

Kim Rəcəb ayında iki gün oruc tutsa, (Allah tərəfindən) ona deyilər: Bu gün yenidən həyatına başla (və yaxşı əməllər et). Sənin keçmiş günahların bağışlandı.

Kim Rəcəb ayında üç gün oruc tutsa, ona deyilər: Sənin keçmiş və gələcək (səhvən edəcəyin) günahların bağışlandı. Mömin qardaşlarından kimi istəyirsən (Allahın izni ilə) şəfət et!

Kim Rəcəb ayında yeddi gün oruc tutsa, yeddi cəhənnəmin qapısı onun üzünə bağlanacaqdır.

Kim Rəcəb ayında səkkiz gün oruc tutsa, səkkiz Cənnətin qapısı onun üzünə açıq olacaq və hansı qapıdan istəsə daxil olacaqdır".

## 5-ci hədis:

## Rəcəb ayının orucu Sirat körpüsündən keçid vərəqəsidir

«قَالَ أَبُو جَعْفَرٍ مُحَمَّدُ بْنُ عَلِيٍّ (ع) مَنْ صَامَ سَبْعَةَ أَيَّامٍ مِنْ رَجَبٍ أَجَازَهُ اللَّهُ عَلَى الصِّرَاطِ وَ أجازه [أَجَارَهُ] مِنَ النَّارِ وَ أَوْجَبَ لَهُ غُرُفَاتِ الْجِنَانِ»؛

İmam Baqir (ə) buyurub: "Kim Rəcəb ayında yeddi gün oruc tutsa, Allah-Taala ona Sirat körpüsündən keçməyə icazə, Cəhənnəm odundan nicat verəcək və Cənnət bağlarını ona vacib edəcəkdir".

## 6-cı hədis: Məb`əs günü oruc tutmağın savabı: 60 il ibadət!

«قَالَ الصَّادِقُ جَعْفَرُ بْنُ مُحَمَّدٍ (ع) لَا تَدَعْ صِيَامَ يَوْمِ سَبْعَةٍ وَ عِشْرِينَ مِنْ رَجَبٍ فَإِنَّهُ الْيَوْمُ الَّذِي نَزَلَتْ فِيهِ النُّبُوَّةُ عَلَى مُحَمَّدٍ (ص) وَ ثَوَابُهُ مِثْلُ سِتِّينَ شَهْراً لَكُمْ»؛

İmam Sadiq (ə) buyurub: "Rəcəb ayının 27-ci günün orucunu unutmayın. Belə ki, bu gün həzrət Məhəmməd (s) Allah-Taala tərəfindən peyğəmbərliyə seçildi. Bu günün orucunun savabı altımış ayın orucunun savabına bərabərdir".

## 7-ci hədis:

İmam Rzadan (ə) rəvayət olunan hədisdə Rəcəb ayının 27-ci gününün savabı 70 ilin orucunun savabına bərabər sayılmışdır.

## 8 və 9-cu hədis:

## Həzrət Nuh (ə) Rəcəb ayının birinci günü gəmiyə mindi

«عَنْ أَبِي الْحَسَنِ (ع) قَالَ إِنَّ نُوحاً (ع) رَكِبَ السَّفِينَةَ أَوَّلَ يَوْمٍ مِنْ رَجَبٍ فَأَمَرَ مَنْ مَعَهُ أَنْ يَصُومُوا ذَلِكَ الْيَوْمَ وَ قَالَ مَنْ صَامَ ذَلِكَ تَبَاعَدَتْ عَنْهُ النَّارُ مَسِيرَةَ سَنَةٍ وَ مَنْ صَامَ سَبْعَةَ أَيَّامٍ أُغْلِقَتْ عَنْهُ أَبْوَابُ النِّيرَانِ السَّبْعَةُ وَ مَنْ صَامَ ثَمَانِيَةَ أَيَّامٍ فُتِحَتْ لَهُ الْجِنَانُ الثَّمَانِيَةُ وَ مَنْ صَامَ خَمْسَةَ عَشَرَ يَوْماً أُعْطِيَ مَسْأَلَتَهُ وَ مَنْ زَادَ زَادَهُ اللَّهُ»؛

İmam Sadiq (ə) və İmam Kazım (ə) buyurublar: "Nuh (ə) Rəcəb ayının 1-ci günü gəmiyə mindi və onunla yola çıxanlara əmr etdi ki, bu gün oruc tutsunlar".

## Dua və istəklər qəbul olunan günü

Sonra İmam Musa Kazım (ə) buyurur: "Kim bu gündə oruc tutsa, Cəhənnəm odu ondan bir illik fasilə ilə uzaqlaşacaqdır. Kim bu ayda yeddi gün oruc tutsa, yeddi cəhənnəmin qapısı onun üzünə bağlanacaqdır. Kim səkkiz gün oruc tutsa, səkkiz Cənnətin qapısı onun üzünə açılacaqdır. Kim on beş gün oruc tutsa, dua və istəkləri qəbul olacaqdır. Kim oruc tutduğu günlərin sayın artırsa, Allah-Taala da savabın miqdarını artıracaqdır".

## 10-cu hədis:

## "Rəcəb" cənnətdə çay adıdır

«عَنْ أَبِي الْحَسَنِ (ع) قَالَ رَجَبٌ نَهَرٌ فِي الْجَنَّةِ أَشَدُّ بَيَاضاً مِنَ اللَّبَنِ وَ أَحْلَى مِنَ الْعَسَلِ مَنْ صَامَ يَوْماً مِنْ رَجَبٍ سَقَاهُ اللَّهُ مِنْ ذَلِكَ النَّهَرِ»؛

İmam Kazım (ə) buyurur: "Rəcəb cənnətdə süddən ağ, baldan şirin bir çaydır. Kim Rəcəb ayında bir gün oruc tutsa, Allah-Taala onu bu çaydan sirab edər".

## 11- ci hədis:

## Rəcəb ayında yaxşı əməllərin savabı ikiqat yazılır

«قَالَ أَبُو الْحَسَنِ (ع) رَجَبٌ شَهْرٌ عَظِيمٌ يُضَاعِفُ اللَّهُ فِيهِ الْحَسَنَاتِ وَ يَمْحُو فِيهِ السَّيِّئَاتِ وَ مَنْ صَامَ يَوْماً مِنْ رَجَبٍ تَبَاعَدَتْ عَنْهُ النَّارُ مَسِيرَةَ سَنَةٍ وَ مَنْ صَامَ ثَلَاثَةَ أَيَّامٍ وَجَبَتْ لَهُ الْجَنَّةُ»؛

İmam Kazım (ə) buyurur: "Rəcəb böyük aydır. Allah-Taala bu ayda yaxşılıqları çox yazar. Pis əməlləri əməl dəftərindən silər. Kim bu ayda bir gün oruc tutsa, cəhənnəm odu ondan bir illik yol fasiləsi ilə uzaqlaşar. Kim bu ayda üç gün oruc tutsa, cənnət ona vacib olar".

## 12-ci hədis:

## Rəcəb Allah-Taalanın ayıdır

«عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ قَالَ: قَالَ رَسُولُ اللَّهِ (ص): أَلَا إِنَّ رَجَبَ شَهْرُ اللَّهِ الْأَصَمُّ وَ هُوَ شَهْرٌ عَظِيمٌ وَ إِنَّمَا سُمِّيَ الْأَصَمَّ لِأَنَّهُ لَا يُقَارِنُهُ شَهْرٌ مِنَ الشُّهُورِ عِنْدَ اللَّهِ عَزَّ وَ جَلَّ حُرْمَةً وَ فَضْلًا وَ كَانَ أَهْلُ الْجَاهِلِيَّةِ يُعَظِّمُونَهُ فِي جَاهِلِيَّتِهَا فَلَمَّا جَاءَ الْإِسْلَامُ لَمْ يَزْدَدْ إِلَّا تَعْظِيماً وَ فَضْلًا، أَلَا وَ إِنَّ رَجَبَ شَهْرُ اللَّهِ وَ شَعْبَانَ شَهْرِي وَ شَهْرَ رَمَضَانَ شَهْرُ أُمَّتِي»

Əbu Səid Xidri deyir: "Peyğəmbər (s) buyurdu: "Agah olun ki, Rəcəb Allahın "Əsəm" ayıdır. O, böyük aydır. Allah yanında ondan hörmətli və fəzilətli bir ay olmadığı üçün "Əsəm" adlandı. Cahiliyyət zamanı hörmətli və əziz idi. İslam gəldikdən sonra böyüklük və fəziləti daha da çoxaldı. Agah olun ki, Rəcəb Allahın ayı, Şəban mənim ayım və Ramazan ümmətimin ayıdır".

**«أَلَا وَ مَنْ صَامَ مِنْ رَجَبٍ يَوْماً إِيمَاناً وَ احْتِسَاباً اسْتَوْجَبَ رِضْوَانَ اللَّهِ الْأَكْبَرَ وَ أَطْفَى صَوْمُهُ فِي ذَلِكَ الْيَوْمِ غَضَبَ اللَّهِ عَزَّ وَ جَلَّ وَ أَغْلَقَ عَنْهُ بَاباً مِنْ أَبْوَابِ النَّارِ وَ لَوْ أُعْطِيَ مِلْءَ الْأَرْضِ ذَهَباً مَا كَانَ بِأَفْضَلَ مِنْ صَوْمِهِ وَ لَا يَسْتَكْمِلُ أَجْرَهُ بِشَيْءٍ مِنَ الدُّنْيَا دُونَ الْحَسَنَاتِ إِذَا أَخْلَصَهُ لِلَّهِ عَزَّ وَ جَلَّ وَ لَهُ إِذَا أَمْسَى (عشر) دَعَوَاتٌ مُسْتَجَابَاتٌ إِنْ دَعَا شَيْئاً فِي عَاجِلِ الدُّنْيَا أَعْطَاهُ اللَّهُ وَ إِلَّا ادَّخَرَ لَهُ مِنَ الْخَيْرِ أَفْضَلَ مَا دَعَا بِهِ دَاعٍ مِنْ أَوْلِيَائِهِ وَ أَحِبَّائِهِ وَ أَصْفِيَائِهِ»**

"Agah olun! Kim Rəcəb ayında bir gün iman və ixlas ilə oruc tutsa, Allah ondan razı olar, onun orucu Allahın qəzəbini söndürər, Cəhənnəm qapılarından biri onun üzünə bağlanar. Dünya dolu qızıl onun orucunun qiyməti deyil. Allah üçün etdiyi yaxşı işlər olmadan onun savabını dünya malından heç bir şey kamil etməz. Gecə olanda onun (on)[6] duası qəbul olacaqdır. Əgər dünyaya xatir bir şey istəsə, Allah-Taala ona bəxş edəcəkdir. Əgər dünyası üçün bir şey istəməsə, Allah vəliləri və dostlarının dua elədiyindən daha xeyirlisi onun axirəti üçün tədarük olunacaqdır.

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ يَوْمَيْنِ لَمْ يَصِفِ الْوَاصِفُونَ مِنْ أَهْلِ السَّمَوَاتِ وَ الْأَرْضِ مَا لَهُ عِنْدَ اللَّهِ مِنَ الثَّوَابِ وَ الْكَرَامَةِ وَ كُتِبَ لَهُ مِنَ الْأَجْرِ مِثْلُ أُجُورِ عَشَرَةٍ مِنَ الصَّادِقِينَ فِي عُمُرِهِمْ بَالِغَةً أَعْمَارُهُمْ مَا بَلَغَتْ وَ يُشَفَّعُ يَوْمَ الْقِيَامَةِ فِي مِثْلِ مَا يَشْفَعُونَ فِيهِ وَ يَحْشُرُهُمْ فِي زُمْرَتِهِمْ حَتَّى يَدْخُلَ الْجَنَّةَ وَ يَكُونَ مِنْ رُفَقَائِهِمْ»**

"Kim Rəcəb ayında iki gün oruc tutsa, onun Allah yanında olan kəramət və savabını yer və göy əhli vəsf edə bilməzlər. Onun üçün on düz danışan adamın ömürləri boyu topladıqları əcr və savab yazılar. Qiyamət günü şəfaət olunanların sayı qədər şəfaət edər və onlarla bir yerdə məşhur olar və onlarla bir yerdə Cənnətə girib, onlarla dost olar".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ ثَلَاثَةَ أَيَّامٍ جَعَلَ اللَّهُ بَيْنَهُ وَ بَيْنَ النَّارِ خَنْدَقاً أَوْ حِجَاباً طُولُهُ مَسِيرَةُ سَبْعِينَ عَاماً وَ يَقُولُ اللَّهُ عَزَّ وَ جَلَّ لَهُ عِنْدَ إِفْطَارِهِ لَقَدْ وَجَبَ حَقُّكَ عَلَيَّ وَ وَجَبَتْ لَكَ مَحَبَّتِي وَ وَلَايَتِي أُشْهِدُكُمْ يَا مَلَائِكَتِي أَنِّي قَدْ غَفَرْتُ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ وَ مَا تَأَخَّرَ»**

"Kim Rəcəb ayında üç gün oruc tutsa, Allah-Taala onunla Cəhənnəm odu arasında 70 illik yol miqdarında fasilə yaradacaqdır. Allah-Taala iftar zamanı ona deyər: "Sənin haqqın mənə vacib oldu. Mənim məhəbbətim və

*6 - Şeyx Səduq, əl-Əmali, s.534, məclis:80;*

vilayətim sənə vacib oldu. Şahid olun ey mələklərim, Mən onun keçmiş və gələcək günahlarını bağışladım".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ أَرْبَعَةَ أَيَّامٍ عُوفِيَ مِنَ الْبَلَايَا كُلِّهَا مِنَ الْجُنُونِ وَ الْجُذَامِ وَ الْبَرَصِ وَ فِتْنَةِ الدَّجَّالِ وَ أُجِيرَ مِنْ عَذَابِ الْقَبْرِ وَ كُتِبَ لَهُ أُجُورُ أُولِي الْأَلْبَابِ وَ التَّوَّابِينَ الْأَوَّابِينَ وَ أُعْطِيَ كِتَابَهُ يَمِينَهُ فِي أَوَائِلِ الْعَابِدِينَ»**

"Kim Rəcəb ayında dörd gün oruc tutsa, dəlilik, cüzam, ala və Dəccalın fitnəsi kimi bütün bəlalardan və qəbir əzabından aman və afiyətdə olacaqdır. Onun üçün "Ulul-əlbab", "Təvvab" və "Əvvab"ların əcri yazılacaq və əməl dəftəri sağ əlinə veriləcəkdir".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ خَمْسَةَ أَيَّامٍ كَانَ حَقّاً عَلَى اللَّهِ عَزَّ وَ جَلَّ أَنْ يُرْضِيَهُ يَوْمَ الْقِيَامَةِ وَ بَعَثَ يَوْمَ الْقِيَامَةِ وَ وَجْهُهُ كَالْقَمَرِ لَيْلَةَ الْبَدْرِ وَ كَتَبَ لَهُ عَدَدَ رَمْلِ عَالِجٍ حَسَنَاتٍ وَ أُدْخِلَ الْجَنَّةَ بِغَيْرِ حِسَابٍ وَ يُقَالُ لَهُ تَمَنَّ عَلَى رَبِّكَ مَا شِئْتَ»**

"Kim Rəcəb ayında beş gün oruc tutsa, Allah-Taalaya haqdır ki, Qiyamət günü onu xoşhal etsin. O qiyamət günü üzü on dörd gecəlik ay kimi parlaq halda gələcəkdir. Ona qumların sayı qədər yaxşılıq yazılacaqdır. Cənnətə sorğusuz daxil olacaqdır. Və ona deyilər: "İstədiyin qədər Rəbbinə naz et".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ سِتَّةَ أَيَّامٍ خَرَجَ مِنْ قَبْرِهِ وَ لِوَجْهِهِ نُورٌ يَتَلَأْلَأُ أَشَدُّ بَيَاضاً مِنْ نُورِ الشَّمْسِ وَ أُعْطِيَ سِوَى ذَلِكَ نُوراً يَسْتَضِيءُ بِهِ أَهْلُ يَوْمِ الْجَمْعِ الْقِيَامَةِ وَ بُعِثَ مِنَ الْآمِنِينَ حَتَّى يَمُرَّ عَلَى الصِّرَاطِ بِغَيْرِ حِسَابٍ وَ يُعَافَى عُقُوقَ الْوَالِدَيْنِ وَ قَطِيعَةَ الرَّحِمِ».**

"Kim Rəcəb ayında altı gün oruc tutsa, qəbrindən üzü Günəşin işığından da nurlu halda qalxacaqdır. Onun nurundan Qiyamət günü toplananların da üzü işıqlanacaqdır. Qiyamət günü əmniyyətdə və sorğusuz məşhur olacaq və sirat körpüsündən keçəcəkdir. Əgər valideynlərinə aq və qohumlarla əlaqəsini kəsmiş olsa (tövbə etsə) günahları bağışlanacaqdır".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ سَبْعَةَ أَيَّامٍ فَإِنَّ لِجَهَنَّمَ سَبْعَةَ أَبْوَابٍ يُغْلِقُ اللَّهُ لِصَوْمِ كُلِّ يَوْمٍ بَاباً مِنْ أَبْوَابِهَا وَ حَرَّمَ اللَّهُ جَسَدَهُ عَلَى النَّارِ».**

"Kim Rəcəb ayında yeddi gün oruc tutsa, Cəhənnəmin yeddi qapısı onun üzünə bağlanacaqdır. Allah-Taala onun bədənini oda haram edəcəkdir".

«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ ثَمَانِيَةَ أَيَّامٍ فَإِنَّ لِلْجَنَّةِ ثَمَانِيَةَ أَبْوَابٍ يَفْتَحُ لَهُ بِصَوْمِ كُلِّ يَوْمٍ بَاباً مِنْ أَبْوَابِهَا وَ يُقَالُ لَهُ ادْخُلْ مِنْ أَيِّ أَبْوَابِ الْجِنَانِ شِئْتَ».

"Kim Rəcəb ayında səkkiz gün oruc tutsa, Cənnətin səkkiz qapısı onun üçün açıq olar və ona deyilər ki, Cənnətin hansı qapısından istəyirsən daxil ol!"

«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ تِسْعَةَ أَيَّامٍ خَرَجَ مِنْ قَبْرِهِ وَ هُوَ يُنَادِي لَا إِلَهَ إِلَّا اللَّهُ وَ لَا يُصْرَفُ وَجْهُهُ دُونَ الْجَنَّةِ وَ خَرَجَ مِنْ قَبْرِهِ وَ لِوَجْهِهِ نُورٌ يَتَلَأْلَأُ لِأَهْلِ الْجَمْعِ حَتَّى يَقُولُوا هَذَا نَبِيٌّ مُصْطَفًى وَ إِنَّ أَدْنَى مَا يُعْطَى أَنْ يَدْخُلَ الْجَنَّةَ بِغَيْرِ حِسَابٍ».

"Kim Rəcəb ayında doqquz gün oruc tutsa, Qiyamət günü "La İlahə illəllah" deyərək qəbirdən qalxacaqdır. Onun Cənnətə getməyinə heç bir maneə olmayacaqdır. Qəbrindən üzünün nuru hamını heyrətə salacaq halda xaric olacaq, hətta onu görənlər təəccüblə deyərlər: Bu seçilmiş Peyğəmbərdir! Onun ən az mükafatı budur ki, cənnətə sorğu-sualsız daxil olacaqdır".

«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ عَشَرَةَ أَيَّامٍ جَعَلَ اللَّهُ عَزَّ وَ جَلَّ لَهُ جَنَاحَيْنِ أَخْضَرَيْنِ مَنْظُومَيْنِ بِالدُّرِّ وَ الْيَاقُوتِ يَطِيرُ بِهِمَا عَلَى الصِّرَاطِ كَالْبَرْقِ الْخَاطِفِ إِلَى الْجِنَانِ وَ أَبْدَلَ اللَّهُ سَيِّئَاتِهِ حَسَنَاتٍ وَ كُتِبَ مِنَ الْمُقَرَّبِينَ الْقَوَّامِينَ لِلَّهِ بِالْقِسْطِ وَ كَأَنَّهُ عَبَدَ اللَّهَ عَزَّ وَ جَلَّ أَلْفَ عَامٍ قَائِماً صَابِراً مُحْتَسِباً».

"Kim Rəcəb ayında on gün oruc tutsa, Allah-Taala (Qiyamət günü) ona dürr və yaqut ilə zinətlənmiş iki yaşıl qanad verəcəkdir ki, onlara Sirat körpüsünü göz qamaşdırıcı bir sürətlə keçəcək və cənnətə daxil olacaqdır. Allah-Taala onun pisliklərini yaxşılıqlara çevirəcəkdir. Allah yolunda ədaləti bərpa edən müqərrəb insanlardan hesab edilər. Ona min il Allah üçün xalis ibadət etmişlərin və səbr edənlərin savabı yazılar".

«وَ مَنْ صَامَ أَحَدَ عَشَرَ يَوْماً مِنْ رَجَبٍ لَمْ يُوَافِ يَوْمَ الْقِيَامَةِ عِنْدَ رَبِّهِ أَفْضَلُ ثَوَاباً مِنْهُ إِلَّا مَنْ صَامَ مِثْلَهُ أَوْ زَادَ عَلَيْهِ».

“Kim Rəcəb ayında on bir gün oruc tutsa, bu ayda özü qədər və ya özündən daha artıq oruc tutan şəxs istisna olmaqla, Qiyamət günü Allah dərgahında ondan daha çox savaba malik şəxs tapılmaz.”

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ اثْنَيْ عَشَرَ يَوْماً كُسِيَ يَوْمَ الْقِيَامَةِ حُلَّتَيْنِ خَضْرَاوَيْنِ مِنْ سُنْدُسٍ وَ إِسْتَبْرَقٍ يجير [يُحْبَرُ بِهِمَا لَوْ دُلِّيَتْ حُلَّةٌ مِنْهُمَا إِلَى الْأَرْضِ لَأَضَاءَ مَا بَيْنَ شَرْقِهَا وَ غَرْبِهَا وَ صَارَتِ الدُّنْيَا أَطْيَبَ مِنْ رِيحِ الْمِسْكِ».**

"Kim Rəcəb ayında on iki gün oruc tutsa, Qiyamət günü ona "sündüs" və "istəbrəq"lə zinətlənmiş xalat geyindirərlər ki, əgər o xalatın zinətlərindən bir giləsi yer üzünə düşərsə, Qərbi və Şərqi işıqlandırar. Və dünya "müşk" iyindən də ətirli olar".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ ثَلَاثَةَ عَشَرَ يَوْماً وُضِعَتْ لَهُ يَوْمَ الْقِيَامَةِ مَائِدَةٌ مِنْ يَاقُوتٍ أَخْضَرَ فِي ظِلِّ الْعَرْشِ قَوَائِمُهَا مِنْ دُرٍّ– أَوْسَعُ مِنَ الدُّنْيَا سَبْعِينَ مَرَّةً، عَلَيْهَا صِحَافُ الدُّرِّ وَ الْيَاقُوتِ فِي كُلِّ صَفْحَةٍ سَبْعُونَ أَلْفَ لَوْنٍ مِنَ الطَّعَامِ لَا يُشْبِهُ اللَّوْنُ اللَّوْنَ وَ لَا الرِّيحُ الرِّيحَ فَيَأْكُلُ مِنْهَا وَ النَّاسُ فِي شِدَّةٍ شَدِيدَةٍ وَ كُرَبٍ عَظِيمَةٍ».**

"Kim Rəcəb ayında on üç gün oruc tutsa, Qiyamət günü Ərşin altında onun üçün sütünları dürdən və dünyadan yetmiş dəfə böyük olan yaşıl yaqutdan süfrə açılar. Bu süfrənin üstündə dürr və yaqutdan kasalar vardır ki, hər kasada yetmiş min növ yemək vardır. Bunlardan heç biri iy və növ baxımından bir-birinin oxşarı və təkrar deyildir. Camaat qorxu və qəm içində olanda, o (13 gün oruc tutan) bu yeməklərdən yeyəcək".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ أَرْبَعَةَ عَشَرَ يَوْماً أَعْطَاهُ اللَّهُ مِنَ الثَّوَابِ مَا لَا عَيْنٌ رَأَتْ وَ لَا أُذُنٌ سَمِعَتْ وَ لَا خَطَرَ عَلَى قَلْبِ بَشَرٍ مِنْ قُصُورِ الْجِنَانِ الَّتِي بُنِيَتْ بِالدُّرِّ وَ الْيَاقُوتِ».**

"Kim Rəcəb ayında on gün oruc tutsa, Allah-Taala ona mükafat və savab olaraq, Cənnətdə dürr və yaqut ilə tikilmiş elə qəsrlər verəcəkdir ki, onları nə göz gürmüş, nə qulaq eşitmiş və nə də kimsənin fikir və xəyalından keçmişdir".

**«وَ مَنْ صَامَ خَمْسَةَ عَشَرَ يَوْماً وَقَفَ يَوْمَ الْقِيَامَةِ مَوْقِفَ الْآمِنِينَ فَلَا يَمُرُّ بِهِ مَلَكٌ وَ لَا رَسُولٌ وَ لَا نَبِيٌّ إِلَّا قَالَ طُوبَى لَكَ أَنْتَ آمِنٌ مُشَرَّفٌ مُقَرَّبٌ مَغْبُوطٌ مَحْبُورٌ سَاكِنُ الْجِنَانِ».**

"Kim Rəcəb ayında on beş gün oruc tutsa, Qiyamət günü əmniyyətdə olanların durduğu yerdə duracaqdır. Onu görən Mələk, Rəsul və Nəbilər deyəcəklər: "Xoş sənin halına ki, sən əmniyyətli, şərəfli, müqərrəb, şad və nemət içində, gözəl camallı və cənnət sakinisən".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ سِتَّةَ عَشَرَ يَوْماً كَانَ فِي أَوَائِلِ مَنْ يَرْكَبُ عَلَى دَوَابَّ مِنْ نُورٍ يَطِيرُ بِهِمْ فِي عَرْصَةِ الْجِنَانِ إِلَى دَارِ الرَّحْمَنِ».**

"Kim Rəcəb ayında on altı gün oruc tutsa, Qiyamət günü onun üçün Sirat körpüsündə yetmiş min nurdan çıraq qoyular ki, bu nurların köməyi ilə və mələklərin onu salam və xoş gəldin deyərək müşaiyət etdikləri halda Siratı keçib, cənnətə girsin".

**«وَ مَنْ صَامَ سَبْعَةَ عَشَرَ يَوْماً وُضِعَ لَهُ يَوْمَ الْقِيَامَةِ عَلَى الصِّرَاطِ سَبْعُونَ أَلْفَ مِصْبَاحٍ مِنْ نُورٍ حَتَّى يَمُرَّ عَلَى الصِّرَاطِ بِنُورِ تِلْكَ الْمَصَابِيحِ إِلَى الْجِنَانِ يُشَيِّعُهُ الْمَلَائِكَةُ بِالتَّرْحِيبِ وَ التَّسْلِيمِ».**

"Kim Rəcəb ayında on yeddi gün oruc tutsa, Qiyamət günü Sirat körpüsündə onun üçün yetmiş min çırağ qoyular ki, bu çırağların işığında Sirat körpüsündən keçib Mələklərin salam və xoşgəldin sədaları ilə Cənnətə daxil olar".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ ثَمَانِيَةَ عَشَرَ يَوْماً زَاحَمَ إِبْرَاهِيمَ فِي قُبَّةٍ فِي جَنَّةِ الْخُلْدِ عَلَى سُرُرِ الدُّرِّ وَ الْيَاقُوتِ».**

"Kim Rəcəb ayında on səkkiz gün oruc tutsa, Cənnətdə Dürr və Yaqutdan olan taxtlarda həzrət İbrahimlə (ə) bir yerdə oturacaq".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ تِسْعَةَ عَشَرَ يَوْماً بَنَى اللَّهُ لَهُ قَصْراً مِنْ لُؤْلُؤٍ رَطْبٍ بِحِذَاءِ قَصْرِ آدَمَ وَ إِبْرَاهِيمَ فِي جَنَّةِ عَدْنٍ فَيُسَلِّمُ عَلَيْهِمَا وَ يُسَلِّمَانِ عَلَيْهِ تَكْرِمَةً وَ إِيمَاناً بِحَقِّهِ وَ كُتِبَ لَهُ بِكُلِّ يَوْمٍ يَصُومُ مِنْهَا كَصِيَامِ أَلْفِ عَامٍ».**

"Kim Rəcəb ayında on doqquz gün oruc tutsa, Allah-Taala Ədn Cənnətində ona həzrət Adəm və İbrahimin (ə) yanında qəsr verəcək. Onlar (ə) ona və o da onlara (ə) salam deyəcək (bu onun vacib haqqının və hörmətinin yüksək dəyərləndirilməsi üçün olacaqdır). Onun orucunun hər günü üçün min ilin orucunun savabı yazılar".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ عِشْرِينَ يَوْماً فَكَأَنَّمَا عَبَدَ اللَّهَ عَزَّ وَ جَلَّ عِشْرِينَ أَلْفَ عَامٍ».**

"Kim Rəcəb ayında iyirmi gün oruc tutsa, elə bil Allah-Taalaya iyirmi min il ibadət etmişdir".

«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ إِحْدَى وَ عِشْرِينَ يَوْماً شُفِّعَ يَوْمَ الْقِيَامَةِ فِي مِثْلِ رَبِيعَةَ وَ مُضَرَ كُلُّهُمْ مِنْ أَهْلِ الْخَطَايَا وَ الذُّنُوبِ».

"Kim Rəcəb ayında iyirmi bir gün oruc tutsa, çox sayda günahkar insanları şəfaət edəcəkdir".

«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ اثْنَيْنِ وَ عِشْرِينَ يَوْماً نَادَى مُنَادٍ مِنَ السَّمَاءِ أَبْشِرْ يَا وَلِيَّ اللَّهِ مِنَ اللَّهِ بِالْكَرَامَةِ الْعَظِيمَةِ وَ مُرَافَقَةِ الَّذِينَ أَنْعَمَ اللَّهُ عَلَيْهِمْ مِنَ النَّبِيِّينَ وَ الصِّدِّيقِينَ وَ الشُّهَداءِ وَ الصَّالِحِينَ وَ حَسُنَ أُولئِكَ رَفِيقاً».

"Kim Rəcəb ayında iyirmi iki gün oruc tutsa, göydən çağırarlar: Ey Allahın dostu, sənə İlahidən böyük kəramət və peyğəmbərlər, şəhidlər, siddiqlər, salehlərlə dost olacağını müjdə verirəm! Və onlarla dostluq necə də gözəldir".

«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ ثَلَاثَةً وَ عِشْرِينَ يَوْماً نُودِيَ مِنَ السَّمَاءِ طُوبَى لَكَ يَا عَبْدَ اللَّهِ نَصِبْتَ قَلِيلًا وَ نَعِمْتَ طَوِيلًا طُوبَى لَكَ إِذَا كُشِفَ الْغِطَاءُ عَنْكَ وَ أُفْضِيتَ إِلَى جَسِيمِ ثَوَابِ رَبِّكَ الْكَرِيمِ وَ جَاوَرْتَ الْخَلِيلَ فِي دَارِ السَّلَامِ».

"Kim Rəcəb ayında iyirmi üç gün oruc tutsa, səmadan nida eşidər ki, xoş sənin halına, ey Allahın bəndəs. Az işin müqabilində (bir-neçə gün aclığa səbr edib oruc tutdun)  uzun müddətli nemət qazandın. Xoş sənin halına o zaman ki, pərdələr gözündən götürüləcək və Kərim olan Rəbbinin böyük savabına çatacaqsan və "Darus-səlam"da həzrət Xəlilur-Rəhmanın qonşusu olacaqsan".

«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ أَرْبَعَةً وَ عِشْرِينَ يَوْماً إِذَا نَزَلَ بِهِ مَلَكُ الْمَوْتِ يُرَى لَهُ فِي صُورَةِ شَابٍّ عَلَيْهِ حُلَّةٌ مِنْ دِيبَاجٍ أَخْضَرَ عَلَى فَرَسٍ مِنْ أَفْرَاسِ الْجِنَانِ وَ بِيَدِهِ حَرِيرٌ أَخْضَرُ مُمَسَّكٌ بِالْمِسْكِ الْأَذْفَرِ وَ بِيَدِهِ قَدَحٌ مِنْ ذَهَبٍ مَمْلُوءٌ مِنْ شَرَابِ الْجِنَانِ فَسَقَاهُ إِيَّاهُ عِنْدَ خُرُوجِ نَفْسِهِ فَهَوَّنَ عَلَيْهِ سَكَرَاتِ الْمَوْتِ ثُمَّ يَأْخُذُ رُوحَهُ فِي تِلْكَ الْحَرِيرَةِ فَيَفُوحُ مِنْهَا رَائِحَةٌ يَسْتَنْشِقُهَا أَهْلُ سَبْعِ سَمَاوَاتٍ فَيَظَلُّ فِي قَبْرِهِ رَيَّانَ وَ يُبْعَثُ مِنْ قَبْرِهِ رَيَّانَ حَتَّى يَرِدَ حَوْضَ النَّبِيِّ (ص)».

"Kim Rəcəb ayında iyirmi üç gün oruc tutsa, can verən zaman ölüm mələyini yaşıl dibac geymiş və cənnət atına minmiş bir cavan surətində

görəcək. Ölüm mələyi bir əlində ətirlənmiş yaşıl ipək parça və bir əlində cənnət şərabı ilə dolu bir qədəhlə onu sirab edəcək. Bu zaman onun ruhu asanlıqla alınacaq və Ölüm mələyi onun ruhunu həmin yaşıl parçaya büküb göylərə aparacaq. Bu parçadan qalxan xoş ətri bütün göy əhli hicc edəcəkdir. O öz qəbrində sirab yatacaq və qiyamət günü sirab məbus olacaq və Kövsər hovuzunda Peyğəmbərin hüzuruna çatacaq".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ خَمْسَةً وَ عِشْرِينَ يَوْماً فَإِنَّهُ إِذَا أُخْرِجَ مِنْ قَبْرِهِ يَلْقَاهُ سَبْعُونَ أَلْفَ مَلَكٍ بِيَدِ كُلِّ مَلَكٍ مِنْهُمْ لِوَاءٌ مِنْ دُرٍّ وَ يَاقُوتٍ وَ مَعَهُمْ طَرَائِفُ الْحُلِيِّ وَ الْحُلَلِ فَيَقُولُونَ يَا وَلِيَّ اللَّهِ الْتَجَأْتَ إِلَى رَبِّكَ فَهُوَ مِنْ أَوَّلِ النَّاسِ دُخُولًا فِي جَنَّاتِ عَدْنٍ مَعَ الْمُقَرَّبِينَ الَّذِينَ رَضِيَ اللَّهُ عَنْهُمْ وَ رَضُوا عَنْهُ وَ ذلِكَ الْفَوْزُ الْعَظِيمُ».**

"Kim Rəcəb ayında iyirmi beş gün oruc tutsa, Qiyamət günü qəbrindən qalxdığı zaman əllərində dür və yaqutdan bayraqlar, cənnət libasları və zinətləri olan mələklər onu qarşılayacaq və deyəcəklər: "Ey Allahın dostu, sən öz Rəbbinə pənah gətirmisən (tələs ona tərəf)". O, Allahın onlardan və onların da Allahdan razı olduğu müqərrəb insanlarla ədn cənnətinə daxil olan ilk kəs olacaqdır. Və bu ən böyük feyzdir".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ سِتَّةً وَ عِشْرِينَ يَوْماً بَنَى اللَّهُ لَهُ فِي ظِلِّ الْعَرْشِ مِائَةَ قَصْرٍ مِنْ دُرٍّ وَ يَاقُوتٍ عَلَى رَأْسِ كُلِّ قَصْرٍ خَيْمَةٌ حَرِيرٍ مِنْ حَرِيرِ الْجِنَانِ يَسْكُنُهَا نَاعِماً وَ النَّاسُ فِي الْحِسَابِ».**

"Kim Rəcəb ayında iyirmi altı gün oruc tutsa, Allah-Taala ərşin gölgəsində ona dürr və yaqutdan olan yüz qəsr verəcəkdir ki, hər qəsrin üstündə cənnət ipəyindən xeymə qurulacaq və camaat hesab verəndə o, orada nazla dincələcəkdir".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ سَبْعَةً وَ عِشْرِينَ يَوْماً وَسَّعَ اللَّهُ عَلَيْهِ الْقَبْرَ مَسِيرَةَ أَرْبَعِمِائَةِ أَلْفِ عَامٍ وَ مَلَأَ جَمِيعَ ذَلِكَ مِسْكاً وَ عَنْبَراً».**

"Kim Rəcəb ayında iyirmi yeddi gün oruc tutsa, Allah-Taala onun qəbrini dörd yüz min illik yol qədər genişləndirəcək və bütün bu məsafəni misk-ənbər ətri ilə dolduracaqdır".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ ثَمَانِيَةً وَ عِشْرِينَ يَوْماً جَعَلَ اللَّهُ عَزَّ وَ جَلَّ بَيْنَهُ وَ بَيْنَ النَّارِ سَبْعَ خَنَادِقَ كُلُّ خَنْدَقٍ مَا بَيْنَ السَّمَاءِ وَ الْأَرْضِ مَسِيرَةُ خَمْسِمِائَةِ عَامٍ».**

"Kim Rəcəb ayında iyirmi səkkiz gün oruc tutsa, Allah-Taala onunla cəhənnəm odu arasında yerlə göy arası məsafəsində olan yeddi xəndək fasilə yaradacaqdır ki, bu xəndəklərin hər birinin fasiləsi beş yüz illik məsafədir".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ تِسْعَةً وَ عِشْرِينَ يَوْماً غَفَرَ اللَّهُ لَهُ وَ لَوْ كَانَ عَشَّاراً وَ لَوْ كَانَتِ امْرَأَةً فَاجِرَةً فَجَرَتْ سَبْعِينَ مَرَّةً بَعْدَ مَا أَرَادَتْ بِهِ وَجْهَ اللَّهِ تَعَالَى وَ الْخَلَاصَ مِنْ جَهَنَّمَ يَغْفِرُ اللَّهُ لَهَا».**

"Kim Rəcəb ayında iyirmi doqquz gün oruc tutsa, əgər günahı onlarla olsa da belə, Allah-Taala onun günahlarını bağışlayacaqdır. Əgər facirə (fahişə) bir qadın yetmiş dəfə günah etdikdən sonra bu orucu tutub ixlasla Allah-Taaladan bağışlanmaq və cəhənnəm odundan xilas olmağı istəsə, Allah-Taala onun günahlarını bağışlayacaqdır".

**«وَ مَنْ صَامَ مِنْ رَجَبٍ ثَلَاثِينَ يَوْماً نَادَى مُنَادٍ مِنَ السَّمَاءِ يَا عَبْدَ اللَّهِ أَمَّا مَا مَضَى فَقَدْ غُفِرَ لَكَ فَاسْتَأْنِفِ الْعَمَلَ فِيمَا بَقِيَ وَ أَعْطَاهُ اللَّهُ فِي الْجِنَانِ كُلِّهَا فِي كُلِّ جَنَّةٍ أَرْبَعِينَ مَدِينَةً وَ فِي كُلِّ [جَنَّةٍ أَرْبَعُونَ أَلْفَ أَلْفِ قَصْرٍ فِي كُلِّ قَصْرٍ أَرْبَعُونَ أَلْفَ أَلْفِ بَيْتٍ فِي كُلِّ بَيْتٍ أَرْبَعُونَ أَلْفَ أَلْفِ مَائِدَةٍ مِنْ ذَهَبٍ عَلَى كُلِّ مَائِدَةٍ أَرْبَعُونَ أَلْفَ أَلْفِ قَصْعَةٍ فِي كُلِّ قَصْعَةٍ أَرْبَعُونَ أَلْفَ أَلْفِ لَوْنٍ مِنَ الطَّعَامِ وَ الشَّرَابِ لِكُلِّ طَعَامٍ وَ شَرَابٍ مِنْ ذَلِكَ لَوْنٌ عَلَى حِدَةٍ فِي كُلِّ بَيْتٍ أَرْبَعُونَ أَلْفَ سَرِيرٍ مِنْ ذَهَبٍ طُولُ كُلِّ سَرِيرٍ أَلْفُ ذِرَاعٍ فِي أَلْفَيْ ذِرَاعٍ عَلَى كُلِّ سَرِيرٍ جَارِيَةٌ مِنَ الْحُورِ عَلَيْهَا ثَلَاثُمِائَةِ أَلْفِ ذُؤَابَةٍ مِنْ نُورٍ يَحْمِلُ كُلَّ ذُؤَابَةٍ مِنْهَا أَلْفُ أَلْفِ وَصِيفَةٍ يغلقها [يُغَلِّفُهَا بِالْمِسْكِ وَ الْعَنْبَرِ إِلَى أَنْ يُوَافِيَهَا صَائِمُ رَجَبٍ هَذَا لِمَنْ صَامَ شَهْرَ رَجَبٍ كُلَّهُ قِيلَ يَا نَبِيَّ اللَّهِ فَمَنْ عَجَزَ عَنْ صِيَامِ رَجَبٍ لِضَعْفٍ أَوْ لِعِلَّةٍ كَانَتْ بِهِ أَوِ امْرَأَةٌ غَيْرُ طَاهِرَةٍ يَصْنَعُ مَا ذَا لِيَنَالَ مَا وَصَفْتَ قَالَ يَتَصَدَّقُ فِي كُلِّ يَوْمٍ بِرَغِيفٍ عَلَى الْمَسَاكِينِ وَ الَّذِي نَفْسِي بِيَدِهِ إِنَّهُ إِذَا تَصَدَّقَ بِهَذَا الصَّدَقَةِ فَيَنَالُ مَا وَصَفْتُ وَ أَكْثَرَ إِنَّهُ لَوِ اجْتَمَعَ جَمِيعُ الْخَلَائِقِ عَلَى أَنْ يُقَدِّرُوا قَدْرَ ثَوَابِهِ مِنْ أَهْلِ السَّمَوَاتِ وَ الْأَرَضِينَ مَا بَلَغُوا عُشْرَ مَا يُصِيبُ فِي الْجِنَانِ مِنَ الْفَضَائِلِ وَ الدَّرَجَاتِ قِيلَ يَا رَسُولَ اللَّهِ (ص) فَمَنْ لَمْ يَقْدِرْ عَلَى هَذِهِ الصَّدَقَةِ يَصْنَعُ مَا ذَا لِيَنَالَ مَا وَصَفْتَ قَالَ فَيُسَبِّحُ اللَّهَ عَزَّ وَ جَلَّ كُلَّ يَوْمٍ مِنْ رَجَبٍ إِلَى تَمَامِ ثَلَاثِينَ يَوْماً بِهَذَا التَّسْبِيحِ مِائَةَ مَرَّةٍ سُبْحَانَ الْإِلَهِ الْجَلِيلِ سُبْحَانَ مَنْ لَا يَنْبَغِي التَّسْبِيحُ إِلَّا لَهُ سُبْحَانَ الْأَعَزِّ الْأَكْرَمِ سُبْحَانَ مَنْ لَبِسَ الْعِزَّ وَ هُوَ لَهُ أَهْلٌ»؛**

"Kim Rəcəb ayında otuz gün oruc tutsa, göydən səs gələr ki, Ey Allahın bəndəsi! Keçmiş günhaların bağışlandı. Sonrakı günlərin üçün əməllərini əvvəldən başla.

Allah ona bütün cənnəti bağışlayacaqdır. Hər cənnətdə qırx şəhər. Hər şəhərdə qırx min qəsr. Hər qəsrdə qırx min ev. Hər evdə qızıldan olan qırx min süfrə. Hər süfrədə qırx min kiçik süfrə. Hər kiçik süfrədə qırx min növ yeməli və içməlilər ki, hər birinin rəngi və dadı ayrıdır.

Həmçinin hər evdə qırx min qızıl çarpayı. Hər çarpayının eni min zira[7], uzunluğu iki min ziradır. Hər çarpayıda nurdan üç min saç hörüyü olan Huri (cənnət qızı) vardır. Bu hörüklərin hər birini bir kəniz müşk və ənbərlə ətirləyirlər. Onlar bu işi Rəcəb ayında oruc tutan o Hurinin vəslinə çatana qədər davam edəcəklər. Bu savablar hamısı Rəcəb ayında oruc tutanlar üçündür".

Bu zaman Peyğəmbərdən (s) soruşdular ki, ey Allahın Rəsulu (s), Rəcəb ayında pak olmayan qadınlar və zəifliyə və ya xəstəliyə görə oruc tutmaqa aciz olanlar bu savaba çatmaq üçün nə etsinlər?

Peyğəmbər (s) buyurdu: "Hər gün miskinlərə bir çörək versin. And olsun canımın sahibinə, əgər bu sədəqəni versə, Rəcəb ayında oruc tutanlar çatan savaba, bəlkə daha çoxuna çatacaqdır. Belə ki, əgər bütün yaranmışlar onun savabını saymaq üçün bir yerə toplansalar da, Cənnətdə ona veriləcək fəzilət, məqam və dərəcələrin ondan biri qədərini hesab edib sona çatdıra bilməyəcəklər".

Onlar dedilər: Ey Allahın Rəsulu (s), əgər bir kəs bu sədəqəni də verə bilməsə nə etsin ki, bu savaba çatsın?

Peyğəmbər (s) buyurdu: Hər gün (Rəcəb ayının 30 gününü) yüz dəfə aşağıdakı zikri desin:

**«سُبْحَانَ الْإِلَهِ الْجَلِيلِ سُبْحَانَ مَنْ لَا يَنْبَغِي التَّسْبِيحُ إِلَّا لَهُ سُبْحَانَ الْأَعَزِّ الْأَكْرَمِ سُبْحَانَ مَنْ لَبِسَ الْعِزَّ وَ هُوَ لَهُ أَهْلٌ»**

***"Sübhanəl ilahil cəlil. Sübhanə mən la yənbəğit-təsbihu illa ləhu. Sübhanəl əəzzil əkrəm. Sübhanə mən ləbisəl izzə və huvə ləhu əhlun".***[8]

---

[7] - 50 – 70 sm.

[8] - "Əl-Əmali", Şeyx Səduq, s.539, məclis:80; "Səvabul əmal və iqabul əmal, Şeyx Səduq, səh.58 (Rəcəb ayının orucunun savabı).

# 13- cü hədis:

# Qiyamət günün xoş sədası: "Əynər-Rəcəbiyyun"?

«عَنْ أَبِي رُمْحَةَ الْحَضْرَمِيِّ قَالَ سَمِعْتُ جَعْفَرَ بْنَ مُحَمَّدِ بْنِ عَلِيٍّ (ع) يَقُولُ إِذَا كَانَ يَوْمُ الْقِيَامَةِ نَادَى مُنَادٍ مِنْ بُطْنَانِ الْعَرْشِ أَيْنَ الرَّجَبِيُّونَ فَيَقُومُ أُنَاسٌ يُضِيءُ وُجُوهُهُمْ لِأَهْلِ الْجَمْعِ عَلَى رُءُوسِهِمْ تِيجَانُ الْمُلْكِ مُكَلَّلَةً بِالدُّرِّ وَ الْيَاقُوتِ مَعَ كُلِّ وَاحِدٍ مِنْهُمْ أَلْفُ مَلَكٍ عَنْ يَمِينِهِ وَ أَلْفُ مَلَكٍ عَنْ يَسَارِهِ يَقُولُونَ هَنِيئاً لَكَ كَرَامَةُ اللَّهِ عَزَّ وَ جَلَّ يَا عَبْدَ اللَّهِ فَيَأْتِي النِّدَاءُ مِنْ عِنْدِ اللَّهِ جَلَّ جَلَالُهُ عِبَادِي وَ إِمَائِي وَ عِزَّتِي وَ جَلَالِي لَأُكْرِمَنَّ مَثْوَاكُمْ وَ لَأُجْزِلَنَّ عَطَاكُمْ [عَطَايَاكُمْ] وَ لَأُوتِيَنَّكُمْ مِنَ الْجَنَّةِ غُرَفاً تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهارُ خالِدِينَ فِيها نِعْمَ أَجْرُ الْعامِلِينَ إِنَّكُمْ تَطَوَّعْتُمْ بِالصَّوْمِ لِي فِي شَهْرٍ عَظَّمْتُ حُرْمَتَهُ وَ أَوْجَبْتُ حَقَّهُ مَلَائِكَتِي أَدْخِلُوا عِبَادِي وَ إِمَائِي الْجَنَّةَ ثُمَّ قَالَ جَعْفَرُ بْنُ مُحَمَّدٍ (ع) هَذَا لِمَنْ صَامَ مِنْ رَجَبٍ شَيْئاً وَ لَوْ يَوْماً وَاحِداً فِي [مِنْ] أَوَّلِهِ أَوْ وَسَطِهِ أَوْ آخِرِهِ»؛

Əbu Rumhə Həzrəmi deyir ki, İmam Cəfər Sadiq (ə) buyurur: "Qiyamət günü Ərşin dərinliyindən səs gələr: "Əynər-Rəcəbiyyun"? bu zaman üzləri nur saçan, başlarında mirvarid və yaqutlarla zinətlənmiş şahlıq tacları, hər birinin sağ-solunda onlara "Allahın kəraməti sizə mübarək olsun, ey Allahın bəndələri" deyən minlərlə mələk olan bir qrub adam ayağa qalxarlar. Bu zaman Allah-Taala tərəfindən nida gələr: "Ey Mənim bəndələrim (qullarım və kənizlərim), and olsun izzət və cəlalıma ki, sizin məqamınızı ali, mükafatınızı qiymətli edəcəm, sizə Cənnətdə altından çaylar axan otaqlar verəcəm[9] və siz orada əbədi sakin olacaqsınız. Nə yaxşıdır əməl edənlərin muzdu. Siz mənim üçün hörmətini böyük və haqqını vacib etdiyim ayda oruc tutdunuz. Ey mənim mələklərim, mənim bəndələrimi cənnətə daxil edin".

İmam Sadiq (ə) əlavə etdi: "Bu savablar təkcə Rəcəb ayında bir neçə gün (ayın əvvəli, ortası ya axırı) oruc tutanın mükafatıdır".[10]

---

*[9] - "Ənkəbut" surəsi, ayə:58.*

*[10] - "Rövzətul-vaizin", Fəttal Nişapuri, 2/401.*

# 14- cü hədis:

# Ümmü Davud hədisi və onun əməli

**«حَدِيثُ أُمِّ دَاوُدَ وَ عَمَلُهَا: قَالَ حَدَّثَنِي إِبْرَاهِيمُ بْنُ عُبَيْدِ اللَّهِ بْنِ الْعَلَاءِ قَالَ حَدَّثَتْنِي فَاطِمَةُ بِنْتُ عَبْدِ اللَّهِ بْنِ إِبْرَاهِيمَ بْنِ الْحُسَيْنِ قَالَتْ لَمَّا قَتَلَ أَبُو الدَّوَانِيقِ عَبْدَ اللَّهِ بْنَ الْحَسَنِ بْنِ الْحُسَيْنِ بَعْدَ قَتْلِ ابْنَيْهِ مُحَمَّدٍ وَ إِبْرَاهِيمَ حَمَلَ ابْنِي دَاوُدَ بْنَ الْحُسَيْنِ مِنَ الْمَدِينَةِ مُكَبَّلًا بِالْحَدِيدِ مَعَ بَنِي عَمِّهِ الْحَسَنِيِّينَ إِلَى الْعِرَاقِ فَغَابَ عَنِّي حِيناً وَ كَانَ هُنَاكَ مَسْجُوناً فَانْقَطَعَ خَبَرُهُ وَ أُعْمِي أَثَرُهُ وَ كُنْتُ أَدْعُو اللَّهَ وَ أَتَضَرَّعُ إِلَيْهِ وَ أَسْأَلُهُ خَلَاصَهُ وَ أَسْتَعِينُ بِإِخْوَانِي مِنْ الزُّهَّادِ وَ الْعُبَّادِ وَ أَهْلِ الْجِدِّ وَ الِاجْتِهَادِ وَ أَسْأَلُهُمْ أَنْ يَدْعُوا اللَّهَ لِي أَنْ يَجْمَعَ بَيْنِي وَ بَيْنَ وُلْدِي قَبْلَ مَوْتِي فَكَانُوا يَفْعَلُونَ وَ لَا يُقَصِّرُونَ فِي ذَلِكَ وَ كَانَ يَصِلُ إِلَيَّ أَنَّهُ قَدْ قُتِلَ وَ يَقُولُ قَوْمٌ لَا قَدْ بُنِيَ عَلَيْهِ أُسْطُوَانَةٌ مَعَ بَنِي عَمِّهِ فَتَعَظَّمُ مُصِيبَتِي وَ اشْتَدَّ حُزْنِي وَ لَا أَرَى لِدُعَائِي إِجَابَةً وَ لَا لِمَسْأَلَتِي نُجْحاً فَضَاقَ بِذَلِكَ ذَرْعِي وَ كَبُرَ سِنِّي وَ رَقَّ عَظْمِي وَ صِرْتُ إِلَى حَدِّ الْيَأْسِ مِنْ وَلَدِي لِضَعْفِي وَ انْقِضَاءِ عُمُرِي قَالَتْ ثُمَّ إِنِّي دَخَلْتُ عَلَى أَبِي عَبْدِ اللَّهِ جَعْفَرِ بْنِ مُحَمَّدٍ (ع) وَ كَانَ عَلِيلًا فَلَمَّا سَأَلْتُهُ عَنْ حَالِهِ وَ دَعَوْتُ لَهُ وَ هَمَمْتُ الِانْصِرَافَ قَالَ لِي يَا أُمَّ دَاوُدَ مَا الَّذِي بَلَغَكِ عَنْ دَاوُدَ وَ كُنْتُ قَدْ أَرْضَعْتُ جَعْفَرَ بْنَ مُحَمَّدٍ بِلَبَنِهِ فَلَمَّا ذَكَرَهُ لِي بَكَيْتُ وَ قُلْتُ جُعِلْتُ فِدَاكَ أَيْنَ دَاوُدُ دَاوُدُ مُحْتَبَسٌ فِي الْعِرَاقِ وَ قَدِ انْقَطَعَ عَنِّي خَبَرُهُ وَ يَئِسْتُ مِنَ الِاجْتِمَاعِ مَعَهُ وَ إِنِّي لَشَدِيدَةُ الشَّوْقِ إِلَيْهِ وَ التَّلَهُّفِ عَلَيْهِ وَ أَنَا أَسْأَلُكَ الدُّعَاءَ لَهُ فَإِنَّهُ أَخُوكَ مِنَ الرَّضَاعَةِ قَالَتْ فَقَالَ لِي أَبُو عَبْدِ اللَّهِ يَا أُمَّ دَاوُدَ فَأَيْنَ أَنْتِ عَنْ دُعَاءِ الِاسْتِفْتَاحِ وَ الْإِجَابَةِ وَ النَّجَاحِ وَ هُوَ الدُّعَاءُ الَّذِي يَفْتَحُ اللَّهُ عَزَّ وَ جَلَّ لَهُ أَبْوَابَ السَّمَاءِ وَ تَتَلَقَّى الْمَلَائِكَةُ وَ تُبَشِّرُ بِالْإِجَابَةِ وَ هُوَ الدُّعَاءُ الْمُسْتَجَابُ الَّذِي لَا يُحْجَبُ عَنِ اللَّهِ عَزَّ وَ جَلَّ وَ لَا لِصَاحِبِهِ عِنْدَ اللَّهِ تَبَارَكَ وَ تَعَالَى ثَوَابٌ دُونَ الْجَنَّةِ قَالَتْ قُلْتُ وَ كَيْفَ لِي يَا ابْنَ الْأَطْهَارِ الصَّادِقِينَ قَالَ يَا أُمَّ دَاوُدَ فَقَدْ دَنَا هَذَا الشَّهْرُ الْحَرَامُ يُرِيدُ ع شَهْرَ رَجَبٍ وَ هُوَ شَهْرٌ مُبَارَكٌ عَظِيمُ الْحُرْمَةِ مَسْمُوعُ الدُّعَاءِ فِيهِ فَصُومِي مِنْهُ ثَلَاثَةَ أَيَّامِ الثَّالِثَ عَشَرَ وَ الرَّابِعَ عَشَرَ وَ الْخَامِسَ عَشَرَ وَ هِيَ الْأَيَّامُ الْبِيضُ ثُمَّ اغْتَسِلِي فِي يَوْمِ النِّصْفِ مِنْهُ عِنْدَ زَوَالِ الشَّمْسِ وَ صَلِّي الزَّوَالَ ثَمَانَ رَكَعَاتٍ تُرْسِلِينَ فِيهِنَّ وَ تُحْسِنِينَ رُكُوعَهُنَّ وَ سُجُودَهُنَّ وَ قُنُوتَهُنَّ تَقْرَأُ فِي الرَّكْعَةِ الْأُولَى بِفَاتِحَةِ الْكِتَابِ وَ قُلْ يَا أَيُّهَا الْكَافِرُونَ وَ فِي الثَّانِيَةِ قُلْ هُوَ اللَّهُ أَحَدٌ وَ فِي السِّتِّ الْبَوَاقِي مِنَ السُّوَرِ الْقِصَارِ مَا أَحْبَبْتِ ثُمَّ تُصَلِّينَ الظُّهْرَ ثُمَّ تَرْكَعِينَ بَعْدَ الظُّهْرِ ثَمَانَ رَكَعَاتٍ تُحْسِنِينَ رُكُوعَهُنَّ وَ سُجُودَهُنَّ وَ قُنُوتَهُنَّ وَ لْتَكُنْ صَلَاتُكِ فِي أَطْهَرِ أَثْوَابِكِ فِي بَيْتٍ نَظِيفٍ عَلَى حَصِيرٍ نَظِيفٍ وَ اسْتَعْمِلِي الطِّيبَ فَإِنَّهُ تُحِبُّهُ الْمَلَائِكَةُ وَ اجْتَهِدِي أَنْ لَا يَدْخُلَ عَلَيْكِ أَحَدٌ يُكَلِّمُكِ أَوْ**

يَشْغَلُكِ [ابْنُ الْبَاقِي ذَكَرَ فِي كِتَابِ عَمَلِ السَّنَةِ ما كَتَبْتُ هَاهُنَا مَنْ أَرَادَ أَنْ يَكْتُبَ فَلْيَكْتُبْ مِنْ عَمَلِ السَّنَةِ فَإِذَا فَرَغْتِ مِنَ الدُّعَاءِ فَاسْجُدِي عَلَى الْأَرْضِ وَ عَفِّرِي خَدَّيْكِ عَلَى الْأَرْضِ وَ قُولِي لَكَ سَجَدْتُ وَ بِكَ آمَنْتُ فَارْحَمْ ذُلِّي وَ فَاقَتِي وَ كَبْوَتِي لِوَجْهِي وَ اجْهَدِي أَنْ تسبح [تَسُحَّ عَيْنَاكِ وَ لَوْ مِقْدَارَ رَأْسِ الذُّبَابِ دُمُوعاً فَإِنَّهُ آيَةُ إِجَابَةِ هَذَا الدُّعَاءِ حُرْقَةُ الْقَلْبِ وَ انْسِكَابُ الْعَبْرَةِ فَاحْفَظِي مَا عَلَّمْتُكِ ثُمَّ احْذَرِي أَنْ يَخْرُجَ عَنْ يَدَيْكِ إِلَى يَدِ غَيْرِكِ مِمَّنْ يَدْعُو بِهِ لِغَيْرِ حَقٍّ فَإِنَّهُ دُعَاءٌ شَرِيفٌ وَ فِيهِ اسْمُ اللَّهِ الْأَعْظَمُ الَّذِي إِذَا دُعِيَ بِهِ أَجَابَ وَ أَعْطَى وَ لَوْ أَنَّ السَّمَوَاتِ وَ الْأَرْضَ كَانَتَا رَتْقاً وَ الْبِحَارُ بِأَجْمَعِهَا مِنْ دُونِهَا وَ كَانَ ذَلِكَ كُلُّهُ بَيْنَكِ وَ بَيْنَ حَاجَتِكِ يُسَهِّلُ اللَّهُ عَزَّ وَ جَلَّ الْوُصُولَ إِلَى مَا تُرِيدِينَ وَ أَعْطَاكِ طَلَبَتَكِ وَ قَضَى لَكِ حَاجَتَكِ وَ بَلَّغَكِ آمَالَكِ وَ لِكُلِّ مَنْ دَعَا بِهَذَا الدُّعَاءِ الْإِجَابَةُ مِنَ اللَّهِ تَعَالَى ذَكَراً كَانَ أَوْ أُنْثَى وَ لَوْ أَنَّ الْجِنَّ وَ الْإِنْسَ أَعْدَاءٌ لِوَلَدِكِ لَكَفَاكِ اللَّهُ مَئُونَتَهُمْ وَ أَخْرَسَ عَنْكِ أَلْسِنَتَهُمْ وَ ذَلَّلَ لَكِ رِقَابَهُمْ إِنْ شَاءَ اللَّهُ قَالَتْ أُمُّ دَاوُدَ فَكَتَبَ لِي هَذَا الدُّعَاءَ وَ انْصَرَفْتُ مَنْزِلِي وَ دَخَلَ شَهْرُ رَجَبٍ فَتَوَخَّيْتُ الْأَيَّامَ وَ صُمْتُهَا وَ دَعَوْتُ كَمَا أَمَرَنِي وَ صَلَّيْتُ الْمَغْرِبَ وَ الْعِشَاءَ الْآخِرَةَ وَ أَفْطَرْتُ ثُمَّ صَلَّيْتُ مِنَ اللَّيْلِ مَا سَنَحَ لِي مرتب [وَ بِتُّ فِي لَيْلِي وَ رَأَيْتُ فِي نَوْمِي كَمَا صَلَّيْتُ عَلَيْهِ مِنَ الْمَلَائِكَةِ وَ الْأَنْبِيَاءِ وَ الشُّهَدَاءِ وَ الْأَبْدَالِ وَ الْعُبَّادِ وَ رَأَيْتُ النَّبِيَّ (ص) فَإِذَا هُوَ يَقُولُ لِي يَا بُنَيَّةُ يَا أُمَّ دَاوُدَ أَبْشِرِي فَكُلُّ مَنْ تَرَيْنَ أَعْوَانُكِ وَ إِخْوَانُكِ وَ شُفَعَاءُكِ وَ كُلُّ مَنْ تَرَيْنَ يَسْتَغْفِرُونَ لَكِ وَ يُبَشِّرُونَكِ بِنُجْحِ حَاجَتِكِ فَأَبْشِرِي بِمَغْفِرَةِ اللَّهِ وَ رِضْوَانِهِ فَجُزِيتِ خَيْراً عَنْ نَفْسِكِ وَ أَبْشِرِي بِحِفْظِ اللَّهِ لِوَلَدِكِ وَ رَدِّهِ عَلَيْكِ إِنْ شَاءَ اللَّهُ قَالَتْ أُمُّ دَاوُدَ فَانْتَبَهْتُ عَنْ نَوْمِي فَوَ اللَّهِ مَا مَكَثْتُ بَعْدَ ذَلِكَ إِلَّا مِقْدَارَ مَسَافَةِ الطَّرِيقِ مِنَ الْعِرَاقِ لِلرَّاكِبِ الْمُجِدِّ الْمُسْرِعِ حَتَّى قَدِمَ عَلَيَّ دَاوُدُ فَقَالَ يَا أُمَّاهْ إِنِّي لَمُحْتَبَسٌ بِالْعِرَاقِ فِي أَضْيَقِ الْمَحَابِسِ وَ عَلَيَّ ثِقْلُ الْحَدِيدِ وَ أَنَا فِي حَالِ الْيَأْسِ مِنَ الْخَلَاصِ إِذْ نِمْتُ فِي لَيْلَةِ النِّصْفِ مِنْ رَجَبٍ فَرَأَيْتُ الدُّنْيَا قَدْ خُفِضَتْ لِي حَتَّى رَأَيْتُكِ فِي حَصِيرٍ فِي صَلَاتِكِ وَ حَوْلَكِ رِجَالٌ رُءُوسُهُمْ فِي السَّمَاءِ وَ أَرْجُلُهُمْ فِي الْأَرْضِ عَلَيْهِمْ ثِيَابٌ خُضْرٌ يُسَبِّحُونَ مِنْ حَوْلِكِ وَ قَالَ قَائِلٌ جَمِيلُ الْوَجْهِ [حِلْيَتُهُ حِلْيَةُ النَّبِيِّ ص نَظِيفُ الثَّوْبِ طَيِّبُ الرِّيحِ حَسَنُ الْكَلَامِ فَقَالَ يَا ابْنَ الْعَجُوزِ الصَّالِحَةِ أَبْشِرْ فَقَدْ أَجَابَ اللَّهُ عَزَّ وَ جَلَّ دُعَاءَ أُمِّكَ فَانْتَبَهْتُ فَإِذَا أَنَا بِرَسُولِ أَبِي الدَّوَانِيقِ فَأُدْخِلْتُ عَلَيْهِ مِنَ اللَّيْلِ فَأَمَرَ بِفَكِّ حَدِيدِي وَ الْإِحْسَانِ إِلَيَّ وَ أَمَرَ لِي بِعَشَرَةِ آلَافِ دِرْهَمٍ وَ أَنْ أُحْمَلَ عَلَى نَجِيبٍ وَ أُسْتَسْعَى بِأَشَدِّ السَّيْرِ فَأَسْرَعْتُ حَتَّى دَخَلْتُ إِلَى الْمَدِينَةِ قَالَتْ أُمُّ دَاوُدَ فَمَضَيْتُ بِهِ إِلَى أَبِي عَبْدِ اللَّهِ ع فَسَلَّمَ عَلَيْهِ وَ حَدَّثَهُ بِحَدِيثِهِ فَقَالَ لَهُ الصَّادِقُ ع إِنَّ أَبَا الدَّوَانِيقِ رَأَى فِي النَّوْمِ عَلِيّاً (ع) يَقُولُ لَهُ أَطْلِقْ وَلَدِي وَ إِلَّا لَأُلْقِيَنَّكَ فِي النَّارِ وَ رَأَى كَأَنَّ تَحْتَ قَدَمَيْهِ النِّيرَانَ فَاسْتَيْقَظَ وَ قَدْ سُقِطَ فِي يَدِهِ فَأَطْلَقَكَ»؛

"İbrahim bin Abdullah bin Əla deyir: Fatimə bint Abdullah bin İbrahim bin Hüseyn dedi: "Mənsur Dəvaniqi oğlanlarım Məhəmməd və

İbrahim və ərim Abdullah bin Həsən bin Hüseyni öldürdükdən sonra, o biri oğlum Davudu əmisi oğlanları (Həsənilər – İmam Həsənin (ə) nəslindən olanlar) ilə birlikdə Mədinədən zəncirə bağlanmış halda İraqa gətirərək zindana saldı. Uzun müddət onu görə bilmədim. O burada zindanda idi. Buna baxmayaraq ondan xəbər öyrənə bilmirdim və ondan bir iz yox idi.

Allaha yalvarır, təzərrü edir və onun xilas olmasını istəyirdim. İbadət əhlindən, zahid insanlardan da istəyirdim ki, Allahdan ölümümdən qabaq məni oğluma qovuşdurmağı istəsinlər. Onlar da bunu edirdilər.

Bəzən onun ölüm xəbəri mənə çatırdı. Bəziləri də deyirdilər yox, ölməyib, bəlkə o və əmisi oğlanları dövlət məmurlarının nəzarətindədirlər. Bu zaman müsibət, hüzn və dərdim böyüyür və şiddətlənirdi. Duamın qəbul olamayacağını sanır və istəyimə yetməyəcəyimi fikirləşirdim. Bu minvalla kasıblaşdım, yaşım çoxaldı, sümüklərim zəiflədi. Qocalıb zəiflədyimə və ömrümün sonuna çatdığımı görüncə oğlumu görəcəyimə ümidimi itirdim.

Günlərin birində İmam Cəfər Sadiqin (ə) xəstələndiyini eşidib onun halını yoxlamağa getdim. Onunla görüşüb halın soruşdum və sağalması üçün dua etdim. Durub evə gəlmək istədiyim zaman mənə dedi: "Ya Ümmə Davud (Ey Davudun anası)! Davuddan nə xəbər var?

(Və mən Davuda süd verdiyim zaman İmam Sadiqə də (ə) süd vermişdim – yəni İmam Sadiq (ə) ilə Davud süd qardaşı idilər). Onu (Davudu) mənim yadıma saldığı üçün ağladım. Dedim: Sənə qurban olum. Davud harda olacaq? O, İraqda həbsdədir. Ondan bir xəbər yoxdur. Onu görəcəyimə ümidimi itirmişəm. Mən onu görməyi çox arzulayıram. Səndən istəyirəm ki, onun üçün dua edəsən. Axı o sənin süd qardaşındır.

Bu zaman İmam Sadiq (ə) mənə dedi: "Ey Ümmi Davud! Elə isə sən nə üçün "İstiftah" - "icabət" və "nicat" duasını oxumursan? O bir duadır ki, Allah-Taala onunla göylərin qapısını açır, Mələklər nazil olur və duanın qəbuluna müjdə verirlər. O, qəbul olunmuş duadır və Allah-Taala onu qəbul edəcəkdir. Onu oxuyan üçün Allah yanında cənnətdən başqa savab yoxdur".

İmam Sadiqə (ə) dedim: Mən onu necə oxuyum, ey doğru danışan pakların övladı!

İmam Sadiq (ə) buyurdu: Ey Ümmi Davud! Budur haram ay olan mübarək Rəcəb ayı yaxınlaşıbdır. O mübarək və böyük hörmətli aydır. Dualar bu ayda qəbuldur. Bu ayda üç gün "əyyamul bəyz"i, yəni 13, 14 və 15-ci günləri oruc tut. Sonra 15-ci günün yarısında günorta vaxtı qüsl et. Səkkiz rəkət namaz qıl. Birinci iki rəkətin birinci rəkətində "Fatihə" və "Kafirun" surələrini oxu. İkinci rəkətdə "Fatihə" və "İxlas" surəsini oxu. Bu namazı tələsmədən səbrlə və gözəl rüku, səcdə və qunutla qıl. Qalan altı rəkət namazda (üç dəfə iki rəkət) "Fatihə"dən sonra hansı kiçik surəsni istəsəniz oxuyun. Sonra isə "Zöhr" – günorta namazını qılın. Zöhr namazından sonra da səkkiz rəkət yuxarıda dediyimiz kimi qılın. Bu namazları pak libasda, pak evdə, pak döşəmədə və ətirli halda qılın ki, mələklər ətir iyini sevirlər.

Çalış bu namazı qıldığın zaman bir kəslə danışma. Namazdan sonra dua et. Duanı qurtarandan sonra yerə səcdə et və yanaqlarını torpağa (yerə) sürt və de:

"*Ləkə səcədtu və bikəaməntu. Fərhəm zulli və faqəti və kəvbəti livəchi*"

Çalış çox təsbih (Allaha həmd-səna etmək: Sübhanəllah, Əlhəmdulilah) deyəsən və az da olsa ağlayasan. Çünki ağlamaq, ürəyin yanması bu duanın qəbul olması nişanəsidir. İndi sənə öyrədəcəklərimi əzbərlə. Və onu (etibar etmədiyin) başqalarına öyrətmə ki, ola bilsin əhli olmayan adamların əlinə düşsün və onu batil işlərdə işlətsinlər. Çünki bu dua şərafətli bir duadır və onda "ismi-əzəm" vardır. Hansıki onunla dua etsən, səninlə istəyin arasında göylər, yer və dəryalar fasilə salsa da belə duan qəbul olunacaq, istəklərin veriləcək və arzularına çatacaqsan. Kim (qadın ya kişi) bu duanı oxusa və bütün "ins və cinn" – insanlar və cinlər belə onunla düşmən olsa, Allah-Taala duasını qəbul, düşmənlərini zəlil və onların (düşmənlərin) şərrini duanı oxuyandan uzaq edəcəkdir. İnşaəllah".

(Ümmi Davud:) Sonra İmam Sadiq (ə) duanı mənim üçün yazdı. Evimə döndüm. Mübarək Rəcəb ayı çatdı. Gözlədim "əyyamul-bəyz" günləri gəldi. Həmin günləri oruc tutdum. İmam (ə) dediyi kimi dua etdim

və namazları qıldım. Gecə oldu şam namazını qılıb iftar etdim. Sonra nafilə namazları qılıb yatdım. Yuxuda mələkləri, Ənbiyanı, Şəhidləri və Abidləri gördüm. Sonra Peyğəmbəri (s) gördüm. O (s) mənə dedi: "Ey qızım, ey Ümmi-Davud! Sənə müjdə verirəm ki, gördüklərin hamısı sənin köməklərin, qardaşların və şəfaətçiləridir. Sənin üçün tövbə, istiğfar və dua edir və istəyinin rəva olacağını sənə müjdə verirlər. Sənə müjdə veririəm ki, Allah-Taala səndən razıdır, səni bağışlayacaq, mükafatlandıracaq və oğlunu hifz edərək sənə qaytaracaq, İnşaəllah".

(Ümmi Davud dedi) Bu zaman yuxudan oyandım. Bu hadisədən az bir müddət (iti yerişli süvarinin İraqdan Mədinəyə getdiyi vaxt qədər) keçmişdi ki, Davud evə gəldi. Onun vəziyyətini soruşdum. (Davud) Dedi: "Rəcəb ayının ortaları idi. Mən ağır dəmirlər arasında zindanda idim. Buradan xilas olmağıma isə heç ümidim yox idi. Rəcəb ayının yarısı idi. Gecə yatmışdım. Bu zaman gözümün önündə üfüq parçalandı və səni namaz qılan halda gördüm. Ətrafında başları göydə və ayaqları yerdə olan kişilər var idi. Onların əynində yaşıl libaslar var idi və sənin üçün dua edirdilər. Bu zaman onlardan biri ki, gözəl üzü, təmiz paltarı, gözəl ətri var idi və cəddim Peyğəmbərə (s) oxşayırdı, mənə dedi: "Ey möminə qadının oğlu! Bəşarət olsun sənə ki, ananın duası sənin haqqında qəbul oldu". Bu zaman mən özümə gəldim. Və gördüm ki, Mənsur Dəvaniqinin məmuru qapıda dayanıb. Məni Mənsurun yanına apardılar. Əmr elədi zəncirləri mənim əl-ayağımdan açdılar. Mənə hörmətlə yanaşıb, 10000 dirhəm də pul verdi. Yaxşı bir ata mindirib yola saldı. Məndə sürətlə çapıb bu gün Mədinəyə daxil oldum".

Ümmi Davud deyir: Onunla İmam Sadiqin yanına getdim. Davud Ona (ə) salam verib başına gələnləri danışdı.

İmam Sadiq (ə) buyurdu: Əbu Dəvaniq yuxuda İmam Əlini (ə) görmüşdü. İmam Əli (ə) yuxuda ona dedi ki, övladımı azad et, yoxsa səni

oda atacam! Əbu Dəvaniq ayaqlarının altında od gördü. Bu zaman yuxudan oyanıb səni azad etdi".[11]

[11] - *"İstiftah (Ümmi Davud) duasının mətnini Şeyx Səduq bu kitabda nəql etməmişdir. Lakin bu duanın mətni Hakim Həsəkaninin "Fəzailu şəhri rəcəb" kitabında mövcuddur. Biz burada Hakimin kitabındakı mətni sizə təqdim edirik:*

«اللَّهُمَّ صَلِّ عَلَى مِيكَائِيلَ مَلَكِ رَحْمَتِكَ- وَ الْمَخْلُوقِ لِرَأْفَتِكَ وَ الْمُسْتَغْفِرِ لِأَهْلِ طَاعَتِكَ. اللَّهُمَّ صَلِّ عَلَى إِسْرَافِيلَ حَامِلِ عَرْشِكَ- وَ صَاحِبِ الصُّورِ الْمُنْتَظِرِ لِأَمْرِكَ- الْوَجِلِ الْمُشْفِقِ مِنْ خِيفَتِكَ. اللَّهُمَّ صَلِّ عَلَى حَمَلَةِ الْعَرْشِ الطَّاهِرِينَ- وَ عَلَى السَّفَرَةِ الْكِرَامِ الْبَرَرَةِ- وَ عَلَى مَلَائِكَتِكَ الْكِرَامِ يَا ذَا الْجَلَالِ وَ الْإِكْرَامِ. اللَّهُمَّ صَلِّ عَلَى أَبِينَا آدَمَ بَدِيعِ فِطْرَتِكَ- الَّذِي أَكْرَمْتَهُ بِسُجُودِ مَلَائِكَتِكَ وَ إِبَاحَةِ جَنَّتِكَ. اللَّهُمَّ صَلِّ عَلَى أُمِّنَا حَوَّاءَ الْمُطَهَّرَةِ مِنَ الرِّجْسِ- الْمُتَرَدِّدَةِ بَيْنَ مَحَالِّ الْقُدُسِ. اللَّهُمَّ صَلِّ عَلَى هَابِيلَ وَ شَيْثٍ وَ إِدْرِيسَ- وَ نُوحٍ وَ إِبْرَاهِيمَ وَ مُوسَى وَ لُوطٍ وَ دَاوُدَ- وَ سُلَيْمَانَ وَ زَكَرِيَّا وَ يَحْيَى وَ عِيسَى- وَ إِيشِيعَا وَ إِرْمِيَا وَ دَانِيَالَ وَ عُزَيْرٍ- وَ شَمْعُونَ وَ هَارُونَ وَ يُوشَعَ وَ الْخِضْرِ- وَ ذِي الْقَرْنَيْنِ وَ يُونُسَ وَ إِلْيَاسَ وَ الْيَسَعِ- وَ ذِي الْكِفْلِ وَ الْحَوَارِيِّينَ وَ الْأَتْبَاعِ. اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَ عَلَى آلِ مُحَمَّدٍ- وَ بَارِكْ عَلَى مُحَمَّدٍ وَ آلِ مُحَمَّدٍ- كَمَا صَلَّيْتَ وَ بَارَكْتَ- وَ تَرَحَّمْتَ عَلَى إِبْرَاهِيمَ وَ آلِ إِبْرَاهِيمَ- إِنَّكَ حَمِيدٌ مَجِيدٌ. اللَّهُمَّ صَلِّ عَلَى الشُّهَدَاءِ وَ السُّعَدَاءِ وَ أَئِمَّةِ الْهُدَى- وَ الْأَبْدَالِ وَ الْأَوْتَادِ وَ السُّيَّاحِ وَ الْعُبَّادِ وَ الْمُصْلِحِينَ- وَ الزُّهَّادِ وَ أَهْلِ الْجِدِّ وَ الِاجْتِهَادِ- وَ خَصِّصْ مُحَمَّداً وَ أَهْلَ بَيْتِهِ بِأَفْضَلِ صَلَوَاتِكَ- وَ أَفْضَلِ كَرَامَاتِكَ وَ بَلِّغْ رُوحَهُ تَحِيَّةً وَ سَلَاماً- وَ زِدْهُ فَضْلًا وَ شَرَفاً وَ كَرَماً- حَتَّى تُبَلِّغَهُ أَعْلَى دَرَجَاتِ أَهْلِ الشَّرَفِ مِنَ النَّبِيِّينَ- وَ الْمُرْسَلِينَ وَ الْأَفَاضِلِ الْمُقَرَّبِينَ. اللَّهُمَّ صَلِّ عَلَى مَنْ سَمَّيْتُ وَ مَنْ لَمْ أُسَمِّ مِنْ مَلَائِكَتِكَ- وَ أَنْبِيَائِكَ وَ رُسُلِكَ وَ أَهْلِ طَاعَتِكَ- وَ أَوْصِلْ صَلَوَاتِي إِلَيْهِمْ وَ إِلَى أَرْوَاحِهِمْ- وَ اجْعَلْهُمْ إِخْوَانِي فِيكَ وَ أَعْوَانِي عَلَى دُعَائِكَ. وَ اسْتَشْفِعْ بِكَرَمِكَ إِلَى كَرَمِكَ- وَ بِجُودِكَ إِلَى جُودِكَ وَ بِرَحْمَتِكَ إِلَى رَحْمَتِكَ- وَ بِأَهْلِ طَاعَتِكَ إِلَيْكَ. اللَّهُمَّ إِنِّي أَدْعُوكَ بِكُلِّ مَا سَأَلَكَ أَحَدٌ مِنْهُمْ- مِنْ مَسْأَلَةٍ شَرِيفَةٍ غَيْرِ مَرْدُودَةٍ- وَ بِمَا دَعَوْكَ بِهِ مِنْ دَعْوَةٍ مُجَابَةٍ غَيْرِ مُخَيَّبَةٍ. يَا اللَّهُ يَا رَحْمَانُ يَا رَحِيمُ يَا كَرِيمُ يَا حَلِيمُ يَا عَظِيمُ- يَا جَلِيلُ يَا جَمِيلُ يَا كَفِيلُ يَا وَكِيلُ يَا مُقِيلُ- يَا مُجِيرُ يَا خَفِيرُ يَا مُنِيرُ يَا خَبِيرُ يَا مُبِينُ يَا مُدِيلُ- يَا مُجِيرُ يَا كَبِيرُ يَا قَدِيرُ يَا بَصِيرُ يَا شَكُورُ- يَا بَرُّ يَا طَاهِرُ يَا سَاتِرُ يَا مُحِيطُ يَا قَرِيبُ- يَا وَدُودُ يَا حَمِيدُ يَا مُبْدِئُ يَا مُعِيدُ يَا شَهِيدُ- يَا مُحْسِنُ يَا مُجْمِلُ يَا مُنْعِمُ يَا مُفْضِلُ يَا قَابِضُ يَا بَاسِطُ- يَا هَادِي يَا مُرْسِلُ يَا مُرْشِدُ يَا مُسَدِّدُ- يَا مُعْطِي يَا مَانِعُ يَا دَافِعُ يَا بَاقِي يَا خَلَّاقُ- يَا رَزَّاقُ يَا وَهَّابُ يَا تَوَّابُ يَا فَتَّاحُ يَا نَفَّاعُ- يَا نَفَّاحُ يَا مَنْ بِيَدِهِ كُلُّ مِفْتَاحٍ يَا رَءُوفُ يَا عَطُوفُ- يَا كَافِي يَا شَافِي يَا مُعَافِي يَا وَفِيُّ يَا مُهَيْمِنُ- يَا عَزِيزُ يَا جَبَّارُ يَا مُتَكَبِّرُ يَا سَلَامُ يَا مُؤْمِنُ- يَا أَحَدُ يَا صَمَدُ يَا فَرْدُ يَا وَتْرُ يَا قُدُّوسُ- يَا نَاصِرُ يَا مُونِسُ يَا بَاعِثُ يَا وَارِثُ يَا عَالِمُ- يَا حَاكِمُ يَا بَارِئُ يَا مُصَوِّرُ يَا مُسْتَجِيبُ يَا دَائِمُ- يَا قَائِمُ يَا قَدِيمُ يَا عَلِيمُ يَا حَكِيمُ يَا جَوَادُ- يَا بَارُّ يَا سَارُّ يَا عَادِلُ يَا فَاضِلُ- يَا دَيَّانُ يَا حَنَّانُ يَا مَنَّانُ».

*"Əllahummə səlli əla Mikailə mələki rəhmətikə vəl məxluqi lirə`fətikə vəl mustəğfiri liəhli taətik. Əllahummə səlli əla İsrafilə hamili ərşikə və sahibis-suril muntəzəri liəmrik, əl-vəcilil muşfiqi min xifətik. Əllahummə səlli əla həmələtil ərşit-tahirin və ələs-səfərtil kiramil bərərə və əla məlaikətikəl kiram, ya zəl cəlali vəl ikram. Əllahummə səlli əla əbina Adəmə bədii fitrətik, əlləzi əkrəmtəhu bi sucudi məlaikətik və ibahəti cənnətik. Əllahummə səlli əla ummina Həvvaəl-mutəhhərti minər-rics, əl-mutərəddidəti bəynə məhallis quds. Əllahummə səlli əla Habilə və Şəysin və İdrisə və Nuhin və İbrahimə və Musa və Lutin və Davudə və Suləymanə və Zəkəriyya və İsa və İşi`ya və İrmiya və Daniyalə və Uzəyrin və Şəmunə və Harunə və Yuşə vəl Xizri və Zil-Qərnəyn və Yunusə və İlyasə vəl Yəsəi və Zil Kifli vəl Həvariyyinə vəl ətbai. Əllahummə səlli əla Muhəmmədin və əla ali Muhəmməd. Və barik əla Muhəmmədin və ali Muhəmməd. Kəma səlləytə və barəktə və trəhhəmtə əla İbrahimə və ali İbrahim, innəkə həmidun məcid. Əllahummə səlli ələş şuhədai vəs suədai və əimmətil huda vəl əbdali vəl əvtadi vəs suyyahi vəl ibadi vəl muslihin vəz zuhhadi və əhlil cəddi vəl ictihad və xəssis Muhəmmədən və əhlə bəytihi bi əfzəli sələvatikə və əfzəli kəramatikə və bəlliğ ruhəhu təhiyyətən və sələmən və zidhu fəzlən və şərəfən və kərəma, hətta tubliğəhu ə`la dərəcati əhliş-şərəfi minən-nəbiyyin vəl mursəlin vəl əfazilil muqərrəbin. Əllahummə səlli əla mən səmməytə və mən ləm usəmmi min məlaikətikə və ənbiyaikə və rusulikə və əhli taətik və əvsil sələvati iləyhim və ila ərvahihim vəcəlhum ixvani fikə və ə`vani əla duaikə. Vəstəşfi bikərəmikə ila kərəmik və bicudikə ila cudik və birəhmətikə ila rəhmətik və biəhli taətikə iləyk. Əllahummə inni ədukə bikulli ma səələkə əhədun minhum min məsələtin şərifətin ğəyri mərdudətin və bima dəavkə bihi min də`əvtin mucabətin ğəyri muxibə (mucibə). Ya Allahu ya rəmanu ya rəhimu ya kərimi ya həlimu ya əzimu ya cəlilu ya cəmilu ya kəfilu ya vəkilu ya muqil. Ya muciru ya xəfiru ya muniru ya xəbiru ya mubini ya mudilu ya muciru ya kəbiru ya qədiru ya səbiru ya şəkur. Ya bərru ya zahiru ya satiru ya muhitu ya qərib. Ya vədud ya həmidu ya mubdiu ya muidu ya şəhid. Ya muhsinu ya mucmilu ya munimu ya mufzilu ya qabizu ya basitu. Ya hadi ya mursilu ya murşidu ya musəddid. Ya mu`tu ya maniu ya dafiu ya baqi ya xəllaq. Ya rəzzaqu ya vəhhabu ya təvvabu ya fəttahu ya nəffau. Ya nəffahu ya mən biyədihi kulli miftah, ya rəufu ya ətuf ya kafi ya şafi ya muafi ya vəfiyyu ya muhəymin. Ya əzizu ya cəbbaru ya mutəkəbbiru ya səlamu ya mo`minu ya əhədu ya səmədu ya fərdu ya vətru ya quddus. Ya nasiru ya munisu ya baisu ya varisu ya alim. Ya hakimu ya bariu ya musəvviru ya mustəcibu ya daim. Ya qaimu ya qədimu ya əlimu ya həkimu ya cəvad. Ya barru ya sarru ya adilu ya fazil. Ya dəyyan ya hənnanu ya mənnan".*

# 15- ci hədis:

# Rəcəb ayı sədəqə verməyin savabı

«عَنْ سُفْيَانَ الثَّوْرِيِّ قَالَ حَدَّثَنِي جَعْفَرُ بْنُ مُحَمَّدٍ عَنْ أَبِيهِ مُحَمَّدِ بْنِ عَلِيٍّ عَنْ أَبِيهِ عَلِيِّ بْنِ الْحُسَيْنِ عَنْ أَبِيهِ الْحُسَيْنِ عَنْ أَخِيهِ الْحَسَنِ بْنِ عَلِيٍّ عَنْ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ (ع) قَالَ مَنْ صَامَ يَوْماً مِنْ رَجَبٍ فِي أَوَّلِهِ أَوْ فِي وَسَطِهِ أَوْ فِي آخِرِهِ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ وَ مَا تَأَخَّرَ وَ مَنْ صَامَ ثَلَاثَةَ أَيَّامٍ مِنْ رَجَبٍ فِي أَوَّلِهِ وَ ثَلَاثَةَ أَيَّامٍ فِي وَسَطِهِ وَ ثَلَاثَةَ أَيَّامٍ فِي آخِرِهِ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ وَ مَا تَأَخَّرَ وَ مَنْ أَحْيَا لَيْلَةً مِنْ لَيَالِي رَجَبٍ أَعْتَقَهُ اللَّهُ مِنَ النَّارِ وَ قَبِلَ شَفَاعَتَهُ فِي سَبْعِينَ أَلْفَ رَجُلٍ مِنَ الْمُذْنِبِينَ وَ مَنْ تَصَدَّقَ بِصَدَقَةٍ فِي رَجَبٍ ابْتِغَاءَ وَجْهِ اللَّهِ أَكْرَمَهُ اللَّهُ يَوْمَ الْقِيَامَةِ فِي الْجَنَّةِ مِنَ الثَّوَابِ مَا لَا عَيْنٌ رَأَتْ وَ لَا أُذُنٌ سَمِعَتْ وَ لَا خَطَرَ عَلَى قَلْبِ بَشَرٍ»؛

Süfyan Suri İmam Sadiqdən (ə), O həzrət də atalarının vasitəsilə İmam Əlidən (ə) rəvayət edir ki, İmam Əli (ə) buyurdu: "Kim Rəcəb ayında bir gün - əvvəli ya ortası ya da axırında, oruc tutsa onun keçmiş və gələcək (yəni Allah ona kömək olar ki, gələcəkdə günaha düşməsin) günahları bağışlanar.

Həmçinin Kim Rəcəb ayının üç əvvəl, üç orta və üç axır gününü oruc tutsa onun keçmiş və gələcək günahları bağışlanar.

Kim Rəcəb ayının gecələrindən birini "əhya" (səhərə qədər oyaq qalıb ibadət etmək) saxlayarsa, Allah-Taala onu cəhənnəm odundan xilas edər və onun şəfaətini yetmiş nəfər günahkarın haqqında qəbul edər.

Kim Rəcəb ayında Allah yolunda xalis niyyətlə sədəqə versə, Allah-Taal Qiyamət günü ona elə bir cənnət savabı verər ki, onun mislini görən, eşidən və qəlbindən keçirəm olmayıb".

# 16- cı hədis:

# Malik ibn Ənəs İmam Sadiqdən (ə) Rəcəb hədisi rəvayət edir

«الْحُسَيْنِ بْنِ يَزِيدَ النَّوْفَلِيِّ قَالَ سَمِعْتُ مَالِكَ بْنَ أَنَسٍ الْفَقِيهَ يَقُولُ وَ اللَّهِ مَا رَأَتْ عَيْنِي أَفْضَلَ مِنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ (ع) زُهْداً وَ فَضْلًا وَ عِبَادَةً وَ وَرَعاً فَكُنْتُ أَقْصِدُهُ فَيُكْرِمُنِي وَ يُقْبِلُ عَلَيَّ فَقُلْتُ لَهُ يَوْماً يَا ابْنَ رَسُولِ اللَّهِ (ص) مَا ثَوَابُ مَنْ صَامَ يَوْماً مِنْ رَجَبٍ إِيمَاناً وَ احْتِسَاباً قَالَ وَ كَانَ وَ اللَّهِ إِذَا قَالَ صَدَقَ حَدَّثَنِي أَبِي عَنْ أَبِيهِ عَنْ جَدِّهِ قَالَ قَالَ رَسُولُ اللَّهِ (ص) مَنْ صَامَ يَوْماً مِنْ رَجَبٍ إِيمَاناً وَ احْتِسَاباً غُفِرَ لَهُ فَقُلْتُ لَهُ يَا ابْنَ رَسُولِ اللَّهِ فَمَا ثَوَابُ مَنْ صَامَ يَوْماً مِنْ شَعْبَانَ قَالَ حَدَّثَنِي أَبِي عَنْ أَبِيهِ عَنْ جَدِّهِ قَالَ قَالَ رَسُولُ اللَّهِ (ص) مَنْ صَامَ يَوْماً مِنْ شَعْبَانَ إِيمَاناً وَ احْتِسَاباً غُفِرَ لَهُ»؛

Hüseyn bin Yəzid Nofəli deyir ki, Malik bin Ənəs deyirdi: And olsun Allah ki, mənim gözüm zöhd, fəzilət, ibadət və təqvada Cəfər bin Məhəmməddən (İmam Sadiq) yaxşısını görməyib. Mən hər dəfə onu ziyarət edəndə, O məni hörmətlə qarşılayıb, məni dinləyərdi. Bir gün ondan soruşdum: Ey Rəsulullahın oğlu, Rəcəb ayında iman və ixlasla oruc tutanın savabı nədir?

O (ə) buyurdu (Malik: And olsun Allah ki, düz deyirdi): Atam babamdan və babamda atasından və o da Peyğəmbərdən (s) belə eşidiblər: "Kim Rəcəb ayında bir gün qürbət qəsdi və inamla oruc tutsa günahları bağışlanar"

(Malik:) Ona dedim: Ey Rəsulullahın oğlu, elə isə Şəban ayında oruc tutanın savabı nədir?

O (ə) buyurdu: Atam babamdan və babamda atasından və oda Peyğəmbərdən (s) belə eşidiblər: "Kim Şəban ayında bir gün qürbət qəsdi (Allahın razılığını qazanmaq) və əqidə və imanla oruc tutsa, günahları bağışlanar".[12]

---

[12] - *"Əl-Əmali", Şeyx Səduq, səh.542, məclis:81.*

## 17- ci hədis:

«عَنِ الصَّادِقِ جَعْفَرِ بْنِ مُحَمَّدٍ (ع) قَالَ مَنْ صَامَ سَبْعَةً وَ عِشْرِينَ مِنْ رَجَبٍ كُتِبَ لَهُ أَجْرُ صِيَامِ سَبْعِينَ سَنَةٍ»؛

"Kim Rəcəb ayının iyirmi yeddinci gününü oruc tutsa, Allah-Taala onun üçün yetmiş il orucun savabını yazacaqdır".

## 18- ci hədis:

## Rəcəb ayı oruc tutan anadan yeni doğulan uşaq kimidir

«عَنْ عَبْدِ السَّلَامِ بْنِ صَالِحٍ الْهَرَوِيِّ قَالَ قَالَ عَلِيُّ بْنُ مُوسَى الرِّضَا (ع) مَنْ صَامَ أَوَّلَ يَوْمٍ مِنْ رَجَبٍ رَضِيَ اللَّهُ عَنْهُ يَوْمَ يَلْقَاهُ وَ مَنْ صَامَ يَوْمَيْنِ مِنْ رَجَبٍ رَضِيَ اللَّهُ عَنْهُ يَوْمَ يَلْقَاهُ وَ مَنْ صَامَ ثَلَاثَةَ أَيَّامٍ مِنْ رَجَبٍ رَضِيَ اللَّهُ عَنْهُ وَ أَرْضَاهُ وَ أَرْضَى عَنْهُ خُصَمَاءَهُ يَوْمَ يَلْقَاهُ وَ مَنْ صَامَ سَبْعَةَ أَيَّامٍ مِنْ رَجَبٍ فُتِحَتْ أَبْوَابُ السَّمَاوَاتِ السَّبْعِ بِرُوحِهِ إِذَا مَاتَ حَتَّى يَصِلَ إِلَى الْمَلَكُوتِ الْأَعْلَى وَ مَنْ صَامَ ثَمَانِيَةَ أَيَّامٍ مِنْ رَجَبٍ فُتِحَتْ لَهُ أَبْوَابُ الْجَنَّةِ الثَّمَانِيَةُ وَ مَنْ صَامَ مِنْ رَجَبٍ خَمْسَةَ عَشَرَ يَوْماً قَضَى اللَّهُ عَزَّ وَ جَلَّ لَهُ كُلَّ حَاجَةٍ إِلَّا أَنْ يَسْأَلَهُ فِي مَأْثَمٍ أَوْ فِي قَطِيعَةِ رَحِمٍ وَ مَنْ صَامَ شَهْرَ رَجَبٍ كُلَّهُ خَرَجَ مِنْ ذُنُوبِهِ كَيَوْمَ وَلَدَتْهُ أُمُّهُ وَ أُعْتِقَ مِنَ النَّارِ وَ أُدْخِلَ الْجَنَّةَ مَعَ الْمُصْطَفَيْنَ الْأَخْيارِ»؛

Əbdis-Səlam bin Saleh əl-Hərəvi deyir: İmam Əli bin Musa ər-Riza (ə) buyurdu:

"Kim Rəcəb ayının birinci gününü oruc tutsa, Allah-Taala Qiyamət günü ondan razı olacaqdır.

Kim Rəcəb ayının iki gününü oruc tutsa, Allah-Taala Qiyamət günü ondan razı olacaqdır.

Kim Rəcəb ayında üç gün oruc tutsa, Allah-Taala Qiyamət günü ondan razı olar və onu razı salar və düşmənlərini ondan razı edər.

Kim Rəcəb ayının yeddi gününü oruc tutsa, öldüyü zaman ruhu "mələkutul ə`la"ya yüksələnə qədər yeddi göyün qapıları onun üzünə açıq olacaqdır.

Kim Rəcəb ayının səkkiz gününü oruc tutsa, səkkiz cənnətin qapısı onun üzünə açıq olacaqdır.

Kim Rəcəb ayının on beş gününü oruc tutsa, Allah-Taala onun günah olan və ya qəti-rəhm üçün olan istəklərindən başqa bütün istəklərini verəcəkdir.

Kim Rəcəb ayının hamısını oruc tutsa, anadan olduğu gün kimi günahlardan pak olacaq, cəhənnəm odundan azad olub seçilmiş yaxşı insanlarla birlikdə cənnətə daxil olacaqdır".

**«تم كتاب فضائل رجب بحمد الله و منه و صلى الله على محمد و آله و سلم».**

***"Allahın köməyi ilə "Rəcəb ayının fəzilətləri" kitabı sona yetdi. Allahın salavat və salamı olsun həzrət Məhəmmədə və onun övladlarına".***

***Tərcüməçi: Seyid Məhəmməd Bəşirov***